

# ƏHKAM RİSALƏSİ

(GƏNCLƏR ÜÇÜN ŞƏRİ MƏSƏLƏLƏR VƏ ETİQADİ BƏHSLƏR)

# Mündəricat

## ƏHKAM RİSALƏSİ

### KİTAB HAQQINDA

Kitabın adı:..............................Əhkam risaləsi

(gənclər üçün şəri məsələlər və etiqadi bəhslər)

Müəllif:...................Ayətullah Fazil Lənkərani

Tərcümə edən:.................................M.Əlizadə

Nəşr edən:...........................................Şəhriyar

Çap tarixi:..................................................۲۰۰۶

Çap növbəsi:.........................................Birinci

Tiraj:........................................................۳۰۰۰

۹۶۴-۵۹۳۴-۷۱-۰

səh:۱

### ETİQADİ BƏHSLƏR

#### ?NƏYƏ GÖRƏ DINƏ EHTIYACIMIZ VAR

:Allah-təala Qur`ani-kərimdə buyurur

Ya Məhəmməd! Ümmətinlə birlikdə) batildən haqqa tapınaraq üzünü Allahın fitri)“ (olaraq insanlara verdiyi dinə tərəf tut!”(۱)

Şəri istilahda “din” yə`ni, Allah-təalanın İslam Peyğəmbərinin vasitəsilə bəşəriyyətə səadət və xoşbəxtlik yolunu göstərməkdən ötrü göndərdiyi maarif, qanunlar və .göstərişlər məcmuəsinə deyilir

:Bütün bunlar üç qismə bölünür

;E`tiqadlar .١

;Əxlaq və ədəb qanunları .٢

.Əməli vəzifə və təkliflər .٣

Bəhsimizin ilk mövzusu e`tiqadlardır. Bu mövzunu xülasə şəkildə bəyan etməzdən əvvəl dinin cəmiyyətdə zərurətinə və faydalarına işarə edəcəyik.

## DININ ZƏRURƏTI

---

.Rum”, ٣٠“[١] -١

İnsan bu dünyada hədəfsiz yaradılmamışdır. Allah-təaladan da heç vaxt yersiz və hədəfsiz bir iş baş verməz. Qur`an ayələri və rəvayətlərdən aydın olur ki, insanın yaradılışında hədəf, fəzilət və kamala yetişməklə Allah yanında ən ali dərəcələrə çatmaqdır. Bu ali hədəflərə dəqiq proqram, hərtərəfli qanun və göstərişlərsiz çatmaq mümkün deyildir. Əksinə, bu dəyərli məqamlara çatmaqdan ötrü elə qanun və hökmlərə ehtiyac var ki, fərdi və

ictimai hüquqları qoruyub, azadlıq və rahatlığı tə`min etsin, kamal və səadət yollarını insana göstərsin.

Aydındır ki, belə qanunları bəşərin məhdud ağlı və naqis fikri ilə gətirmək mümkün deyil. Çünki, insan özünün müxtəlif istəklərini o cümlədən, yaradanını və onu əsas hədəflərinə çatdıracaq yolları tanımır. Bəlkə də, çoxları öz səadət və xoşbəxtliklərini dünyada maddi mənafelərinə çatmaqda görüb, mə`nəvi və axirət ehtiyaclarından qafildirlər. Çoxları öz mənafe və məsləhətlərini başqalarının mənafelərindən üstün tutub bu yolda hər bir işə əl atırlar.

Ümumiyyətlə, insanların dünya və axirətdəki səadəti, sağlam e`tiqad, İslam dininin göstərişlərinə əməl edib onun gündəlik (fərdi və ictimai) həyatda tətbiqi ilə bağlı olduğuna görə dinin cəmiyyətdəki zəruriliyi inkarolunmazdır.

## DININ FAYDALARI

Dinin iki cür faydası var:

١. Fərdi faydaları;

٢. İctimai faydaları.

Dinin fərdi faydaları həddən artıqdır. Onlardan üçünün aşağıdakı üç başlıqda göstərmək olar:

١. Qəlbin rahatlığı;

٢. Ruhun güclənməsi;

٣. Şəxsin qorunması.

### ١) QƏLBIN RAHATLIĞI

Allah-təala Qur`ani-kərimdə buyurur:

“O kəslər ki, Allaha iman gətiriblər və Allahı zikr etməklə qəlbləri rahat olur; bilin ki, qəlblər yalnız, Allahı zikr etməklə aramlıq tapar!”[١]

Bəli! Dinin hər bir insana faydalarından biri də odur ki, onu Allahı tanıyan və dindar edir. Elə bir Allah ki, bütün mövcudların



---

.Rə`d", ۲۸"[۲] -۱

yaradıcısı, bütün ne`mətləri əta edən, dəyişməz və sabit bir həqiqətdir. O Allah ki, bütün xeyirlər, izzət, ömür və həyat Onun əlindədir. İmanın vasitəsi ilə insanın batini aram, rahat, razı, qane və səbirli olur. Bəli! Hər kəsin Allahı var, hər şeyi var. Allahı .tanıyanın nə müxtəlif gözlənilməz hadisələrdən və nə də fəlakətdən qorxusu olar

**RUHUN MÖHKƏMLIYI (٢**

Din, insanın iradəsini qüvvətli, bağışlayan və bütün nəfs istəklərini nəzarətdə saxlayan :edir. Allah-təala Həzrət Əli (əleyhəssəlamın) ailəsi barəsində buyurur

Onlar elə kimsələrdirlər ki, etdikləri nəzri yerinə yetirər və dəhşəti aləmi bürüyəcək“ gündən (qiyamət günündən) qorxarlar. Onlar öz iştahları çəkdiyi və özləri yemək .istədikləri halda yeməyi yoxsula, yetimə əsirə yedirdərlər

Biz sizi ancaq Allah rizasından ötrü yedirdirik. Biz sizdən nə bir mükafat, nə də bir (təşəkkür istəyirik.”(١

Bəli! Bu kimi xüsusiyyətlər o ruhda tapılar ki, mütləq, yenilməz və sonsuz qüdrəti olan Allaha imanı olsun. Ruhu zəif olanlar heç vaxt belə bir ali sifətə malik olmazlar. Allaha :bağlı kamil imana sahib olan Peyğəmbərin (s) qüvvəli ruhudur ki, buyurur

Əgər günəşi sağ əlimə və ayı da sol əlimə versəniz, yenə də öz ali hədəfimdən əl“ (götürən deyiləm.”(٢

**ŞƏXSI QORUMAQ (٣**

Dinin insana üçüncü ən böyük faydası, onu müxtəlif həlakedici sifətlərdən və hallardan qorumasıdır. Din, ilk yaranış və qiyamətə e`tiqadı olan şəxsi hər cür fəsad, .başqalarının haqqına təcavüz, zülm və sitəmdən qoruyur

:Əmirəl-mö`minin Həzrət Əli (əleyhəssəlam) buyurur



---

.Dəhr (və ya insan) surəsi, ٧-dən ٩-a qədər[٣] -١

İslam Peyğəmbərinin (səllallahu əleyhi və alihi və səlləm) İslam dini ilk zühuru[٤] -٢

“Allaha and olsun! Gecəni iti tikanlar üstündə oyaq başa vurmağım və ya iri zəncirlərə bağlanıb sürünməyim daha əzizdir ondan ki, qiyamət günündə Allah və Rəsulu ilə elə halda görüşəm ki, bəndələrin bə`zisinə zülm etmiş olam və ya onların mallarından bir şey qəsb etmiş olam……. Allaha and olsun! Yeddi iqlim göylərdə olanları mənim ixtiyarımda qoyalar ki, qarışqanın ağzından arpanın qabığını alam və zülm edəm, heç vaxt etmərəm.”(۱)

Beləliklə, din, insanı daim Allahı xatırlamağa vadar edir. Nəticədə, qəlbi rahatlaşdırır və ruhu qüvvətləndirir. Onu nalayiq işlərdən qoruyub saxlayır.

Bəli, insan doğru və düzgün dinə bağlanıb, dindən olduğu kimi istifadə edərsə, dinin bərəkətindən arzuladığı səadətə yetişər. Çünki, dinin insana həm mə`nəvi və həm də maddi faydaları vardır. Din, insanda özünə e`timad, ruhun möhkəmlənməsi və qəlb şadlığı yaradır. Onu hər cür çirkinlikdən qoruyur və nəticədə canı sağlam, malı qorunmuş, həyatı xoş, adını yaxşı və işlərinin aqibətini xeyir edir. Allah-təala buyurur:

“Mö`min olub yaxşı işlər görən kişi və qadına xoş həyat nəsib edib, etdikləri yaxşı əməllərə görə mükafatlarını verəcəyik.”(۲)

İctimai həyatda yaşayan insanlar, xeyir-şər, izzət, zillət, həyat və ölümdə bir-birləri ilə müştərəkdirlər. Həmçinin, cəmiyyətin tərzi-təfəkkür və hissiyatlarında da oxşarlıqları vardır. Onlar hamısı birlikdə cəmiyyəti təşkil edirlər. Sağlam cəmiyyət bir insan hökmündədir. Cəmiyyətin sağlam, güclü, şad, həmişəlik və həyatdan daha çox faydalanmasından ötrü üç əsas lazımdır.



---

۱- [۵] “Nəhcül-bəlağə”, xütbə ۲۲۴.

۲- [۶] “Nəhl”, ۹۷.

;Cəmiyyətin fərdləri və təbəqələri arasında ülfət, birlik və mehribançılığın olması .۱

;Cəmiyyət üzvlərinin bir-birinə zülm və əziyyət etmələrindən çəkinməsi .۲

Haqq və xeyir işlərdə cəmiyyət üzvlərinin bir-birlərinə köməklik və həmkarlıq . ۳ .etmələri

İlk yaranış və qiyamətə etiqadlı olmaq, qeyd olunan bu üç əsli yaşayış mühitində ən yaxşı şəkildə əməli edir. Dinin cəmiyyətə ən mühüm və birinci faydası cəmiyyət üzvləri arasında mə`nəvi birlik və qardaşlıq yaratmasıdır. Həmçinin, din, insanların qəlblərində bir-birinə qarşı ülfət yaranmasından ötrü ən yaxşı vasitədir. Allah-təala :Qur`ani-kərimdə buyurur

Hamınız bir yerdə Allahın ipindən (dinindən) möhkəm yapışın, bir-birinizdən“ ayrılmayın. Allahın sizə verdiyi ne`mətini xatırlayın ki, siz bir-birinizə düşmən ikən O, sizin qəlblərinizi (İslam ilə) birləşdirdi və Onun ne`məti sayəsində bir-birinizə qardaş (oldunuz.”(۱

Dinin cəmiyyətə ikinci faydası budur ki, din, cəmiyyət üzvlərinin bir-birinə qarşı əzab və əziyyətlərinin qarşısını alır, ən azı azaldır. Cəmiyyətin və ya fərdin bədbəxtçiliyinə səbəb olan şər və fəsad niyyətini məhv edib aradan aparır. Din, insanın batinində yatmış və həmişə fitnə-fəsad törətmək istəyən şeytanın əl-qoluna zəncir vurur və onu cilovlayır. Din, zorakılıq, təkəbbür və fərdin bir-birinə qarşı əxlaqsızlıqlarının qarşısını alır. Din, qohum-əqrəba arasındakı bağlılığı möhkəmləndirir və onun qorunmasına :çalışır. Allah-təala buyurur

Həqiqətən, Allah (Qur`andan insanlara) ədalətli olmağı, yaxşılıq etməyi, qohumlara“ (haqqını) verməyi buyurar. Zina etməyi, pis işlər görməyi və zülm etməyi isə qadağan .edər



---

.Ali-İmran”, ۱۰۳“[۷] -۱

(Allah sizə bəlkə düşünüb ibrət dərsi alasınız deyə, belə öyüd-nəsihət verir.”(1)

Dinin yaşayış mühitinə üçüncü faydası, bütün insanların xeyir işlərdə, bir-birlərinə köməklik göstərib, pis işlərin və günahların qarşısını almaqda əl-ələ vermələrinə çağırmasıdır. Din, insanları ədavət və düşmənçilikdən çəkindirir. Onlara öz növlərindən olan insanların mühitinin cəhənnəmə çevirmələrini qadağan edir. Həmçinin, insanları :bir-birinə əziyyət verməkdən çəkindirir. Allah-təala Qur`anda buyurur

Yaxşılıq və xeyir işlərdə bir-birinizə kömək olun. Günah iş görməkdə və düşmənçilik“ etməkdə bir-birinizə kömək göstərməyin! Allahdan qorxun! Həqiqətən, Allahın əzabı (şiddətlidir.!”(2)

Din öz insanpərvər proqramları və qanunları ilə elə bir yaşayış mühiti təşkil edir ki, belə bir mühitin ruhu mütləq xeyirdir. Belə qüdrətli, xoş və yüksək səviyyəli proqramlarla o .cəmiyyətin fərdlərini dünya və axirətdə xoşbəxt olmağa hazırlaşdırır

İndi ki, dinin mə`nası, zərurəti və faydaları qısa şəkildə aydın oldu, əsas mətləbə qayıdırıq. Qeyd etdiyimiz kimi dinin üç əsas hissəsi var. Bundan sonrakı bəhsimizin :mövzusu e`tiqadlardır. Bəhsə başlamazdan əvvəl aşağıdakı mətləbə diqqət edək

Əməliyyə risaləsinin birinci məsələsində qeyd edildiyi kimi, müsəlman dinin əsaslarına (yə`ni, tövhid, ədl, nübuvvət, imamət və qiyamətə) yəqinlik əldə etməlidir etməlidir. Yəni, bütün bunlara möhkəm şəkildə elm ələ gətirməlidir. Bu sahədə başqasının dediyinə kifayətlənmək olmaz. Qısası, ağıl, ayə və rəvayətlərin hökmlərinə əsasən, hər bir müsəlmana vacibdir ki, dinin əsaslarına yəqinlik əldə etsin. Bu işdə səhlənkarlıq isə əbədi əzaba səbəb olar. Onu da qeyd edək ki, yəqinliyin əsası, qəti



---

.Nəhl”, ٩٠“[٨]-١

.Maidə”surəsi -٢“[٩]-٢

.e`tiqadın hasil olmasıdır. Bu mə`na hansı yolla ələ gəlsə də kifayətdir

Beləliklə, insanların əksəriyyəti dinin əsaslarına alimlərin dediklərindən, ruhani və din müəllimlərinin danışığından, hətta bə`zən, valideynlərinin sözlərindən yəqinlik əldə edirlər. Bütün bunlar danışanın dediyi mətləbə tam etiqadlı olub, yalan və xilafın onda olmadığını bildikdən sonra hasil olur. Həmçinin, ola bilsin ki, müsəlman özü yəqinlik hasil etdikdən sonra öz əqidəsini başqasına isbat etməkdən ötrü dəlil gətirə bilməsin. .Əsas məsələ şəxsin özünün yəqinlik əldə etməsidir

## ?NƏYƏ GÖRƏ ÜSULIDDINDƏ TƏQLID YOXDUR

Din alimlərinin yalnız, “füruiddin”(١)-də təqlid olunması və “üsuliddin”-də təqlidə icazə verməmələrinin, həmçinin, bu məsələdə “icma”(٢)iddia etmələrinin əsas səbəbi budur ki: Təqlid, yə`ni yəqinlik hasil olmasa da müctehidin göstərişlərinə əməl etməkdir. (bə`zilərinə görə, başqasının sözünə dəlilsiz əməl etməkdir). Əgər ayə və rəvayətlərdə dinin əsaslarının iman, mə`rifət və yəqinliklə ələ gətirilməsi vurğulanırsa, iman qəlbin .arxayınlığı və batini yəqinlik sayılırsa, bu mə`na təqlidlə hasil olmur

Başqa sözlə desək, insanı dünya və axirətdə səadətə çatdırıb onu əzab və həlakətdən xilas edən, yalnız, qəlbi e`tiqad və möhkəm imandır. Həmçinin, insanı dini faydalardan bəhrələndirən təkcə, batini inam və yəqinlikdir. Bütün bunlar isə təqlid və əməldən ayrı olub, başqasının deməyi ilə ələ gəlmir. Ona görə də belə məsələlərdə təqlidə yer .yoxdur

Beləliklə, qeyd olunmalıdır ki, dinin əsaslarına inam, yəqinlik və elm əldə etmək nəfsani fəzilətlərdəndir. Allaha e`tiqad, mə`rifət, İlahi sifətlərə inam, peyğəmbərləri və imamları tanımaq, feyz vasitələrini ələ gətirmək, qiyamətə və Allaha tərəf qayıdışa əqidə



---

١- [١٠]Yə`ni, Namaz, Oruc, Həcc, Xums, Zəkat, Cihad, Əmr be mə`ruf və nəhy əz .münkər, təvəlla və təbərra

٢- [١١]Bütün din alimlərinin nəzəriyyəsi.

insanın kamal xüsusiyyətlərindən olub, nəfsin nadanlıq rəzilətindən xaric olmasına .səbəb olur. Ağılın hökmünə əsasən, bütün bunların təqlidsiz ələ gətirilməsi lazımdır

## TƏK ALLAHA E`TIQAD

### İŞARƏ

(Məgər göyləri və yeri yaradan Allaha da şübhə etmək olarmı?”(١“

Allahın vücuduna iqrar və zatına e`tiraf aydın məsələlərdəndir. Kafirlər də buna :e`tiraf edirlər. Belə ki, Allah-təala buyurur

Həqiqətən, əgər, göyləri və yeri kim yaratmış, günəş və ayı kim tabe etmişdir–deyə“ soruşsan, onlar mütləq: Allah–deyə cavab verəcəklər. Elə isə onlara de ki: Niyə (yalandan üz döndərirlər?”(٢

Ona görə də İslam Peyğəmbəri (s) Allahın vücudunun iqrarından ötrü yox, bəlkə də, .insanları tövhid və yeganəpərəstliyə də`vət etməkdən ötrü göndərilmişdir

Bu iqrar və e`tirafın mənşəyi, həmçinin, anlayış və meyllər, Allahın insanın fitrətində :qərar verdiyi dərk və anlayışdan irəli gəlir. Allah-təala buyurur

(Üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə tərəf tut.”(٣“

Bəli, Allah-təala bu həqiqəti hamının təbiətində qərar vermişdir. Ona görə də insan özünün əsl yaranış və zatında hiss edir ki, özbaşına olmayıb yaradana bağlıdır. Yaradan onu qoruyub ona köməklik etməklə yanaşı fikr və əməllərini nəzarətdə .saxlayır

səh:١٠

---

.İbrahim”, ١٠“[١٢]-١

.Ənkəbut”, ٣٠“[١٣]-٢

.Rum”, ٣٠“[١۴]-٣

.Həmin yaradan ki, bütün aləmə hökm edir və mövcudatın varlığı ona bağlıdır

Hər bir mütəfəkkir təsdiq edir ki, bütün aləm müəyyən nəzm və qanuna tabedir. İnsan özü bu qanun və nəzmlərin sayəsində aləmin bütün zərrələrindən bəhrələnir. Havadan nəfəs alır, sudan içir, bitkilərdən yeyir və günəşin şüasından istifadə edir. Anlayır ki, bütün aləm bir qüvvədən sərçeşmə alıb bir iradə altında qərar tutmuşdur. Həmin fitrət, anlayış və dərkə görədir ki, insan möhtac olanda o qüvvəyə əl açır. Çətinlikdə ona pənah aparır və ne`mət istəyərkən ona ümidvar olur. Aydındır ki, belə bir hiss və dərk insanın cahil və zəif olması ilə bağlı deyil. Çünki, hər hansı dəstə və təbəqədən olmasına baxmayaraq, insan hər vaxt özünü bütün elm, e`tiqad, adət və ən`ənələrdən kənara çəksə və özünü təzə dünyaya gəlmiş bir mövcud kimi təsəvvür edib, heç kəsi görməyən və heç bir şey eşitməyən şəxs kimi fərz olunsa, bu dünyaya ?nəzər salıb nə fikirləşər və nə görər

Özünü elə bir mövcud kimi tanıyar ki, gözləri, qulağı və şüuru olan halda bu sonsuz kainatın kiçik bir guşəsində tapılıb. Hansı tərəfə baxırsa, gözləri dünyanın axırını görmür. Cahanı çox-çox böyük və özünü çox-çox kiçik hiss edir. Ayağının altını müxtəlif qəribəliklərlə dolu, başının üstündə fəzanı təəcüblü görür. Dünyaya gəlir, olur və hərəkət müşahidə edir. Günəşin və ayın çıxıb-batmasını görür. Gecə-gündüz ardıcıl olaraq tərtiblə gəlib-gedir. Aylar və fəsillər növbə və nəzmlə dövr edirlər. Gecə vaxtı başının üstündəki fəzanı gözəl parlayan ulduzlarla dolu müşahidə edir. Yer üzündə elə bitkilər və ağaclar görür ki, bə`zilərinin toxumu xırdalıqdan dırnağının da üstündə görünmürdü. Bir müddət sonra isə bu toxumlar böyük cüssəli iri şaxəli müxtəlif rəngli və yarpaqlı ağaclara çevrilirlər. Bu meyvələrin dadı-tamı insanı cana gətirir. Təbiətdə müxtəlif şəkilli, təbiətli və ölçülü heyvanlar görür. Elə mövcudları müşahidə edir ki, bir anda tapılır və yenidən aradan gedir. Dirilir və təzədən ölür. Həyat cərəyanını bitkidən .tutmuş insana qədər hamısında müşahidə edir

Öz xilqətindəki əzəmət və xırdalıqlara nəzər salır. Bədəni, sümükləri, bədənindəki damarlar, başının qəribə sümükləri, göz, 

qulaq, üz, hiss üzləri, qan dövranı, qəlbin vurması, əllərinin xilqəti, barmaqlar, bədən əzalarının tərkibcə birləşmə quruluşu, bədənin lazım olan maddələrlə qidalanması, övlad dünyaya gətirmək mexanizmi, ağılın qüvvəsi, şəhvət, xəyal, vahimə və bədənindəki görünməyən yüzlərlə başqa mövcudları nəzərə alaraq, ixtiyarsız olaraq .yaradana e`tiraf edir

Bəli! Belə olan halda insan öz qəlb gözü ilə bir iradə, bir elm, bir həyat, bütün bu sifətlərə malik bir varlıq həqiqəti və kainatın ruhunu aydınca görür. Onu, bütün mövcudatı əhatə edən, onlara agah, qüdrətli və hər şeyə hərəkət verən kimi tanıyır. Özünü bütün vücudu ilə o varlığa bağlı bilir. Doğrudur ki, onun zatına elmi olmur, kainatın və özünün yaranış sirlərinə tam agah ola bilmir, amma bu qədər anlayır ki, bütün bunların yaradanı var. O, Allahdır. Başa düşür ki, bütün mövcudların fitrətində belə bir anlayış var. Hər şey özünü bütün vücudu ilə Onun varlığına iqrar edir və Ona bağlıdır. Təbii ki, əzəməti müqabilində baş əyib təslim olur və ona səcdə edir. Qur`an :buyurur

Həqiqətən, göylərin və yerin yaradılması, gecə ilə gündüzün bir-birini əvəz etməsi ağıl“ (sahibləri üçün qəti dəlildir.”(۱

Bəli! Ağıl və idrak sahibi azacıq diqqət etsə hiss edər ki, bütün varlıq aləmi, həyat, şüur, görünüş və eşitməklə doludur. Mövcudatın hər birisi öz batini dili ilə Yaradanı ilə raz-.niyaz edir. Onun vücuduna iqrar edib, ona təsbih və tə`riflər söyləyir

Göylərdə və yerdə olanların hamısı (bütün məxluqatın) sahibi, müqəddəs və pak olan“ (yenilməz qüvvət və hikmət sahibi Allahı təsdiq edib Onun şəninə tə`riflər deyər.”(۲

Belə olan halda insan öz yaradanı barədə fikirləşir və Onu axtarır. Belə olmaya da bilməz. Bu halda insanda itaət və bəndəlik əmələ gəlir. Həmin halda insan nə qədər bədbəxt və zülmkar olsa da yenə də Allahın dərgahına üz tutub yalvarır. Bu vəziyyətdə



---

.Rə`d surəsi-۱۶[۱۵]-۱

.Ali-İmran surəsi-۱۹۰[۱۶]-۲

insanların zahirini yox, batinlərini görmək lazımdır. Nə qədər pis və tüğyançı olsa da .insanların batini əsasında hökm etmək lazımdır

Həmin halda insan Allahın elçisi və göstərişləri ardınca gəzir. Onun bəndəliyi və itaətini peyğəmbərinin dilindən öyrənmək istəyir. Ona yaxınlaşır və ondan kömək istəyir. Onun müqabilində vəzifəsini yerinə yetirib müxalifətdən pərhiz etmək istəyir. İmam :Sadiq (əleyhəssəlam) buyurur

:Bütün insanların biliyi dörd sözdədir

;Allahı tanımaq

;Özünü tanımaq

;Vəzifəsini tanımaq

(Azğınlığı tanımaq.(١

:Əmirəlmö`minin Əli (əleyhəssəlam) buyurur

Allah-təala peyğəmbərləri göndərir ki, insanlara öz fitrətlərinin istəyinə uyğun olaraq" İlahi ne`mətləri, onun höccətlərini (dəlillərini) tanıtdırsın və nəfslərində olan sirlərini (açıb onlara göstərsin. Onlar yer üzündəki İlahi nişanələri insanlara göstərir."(٢

#### TÖVHID

Tövhid, dinin əsaslarından birincisidir. Tövhid, yə`ni, Allahın yeganə olub, Onun ayrı-ayrı hissələrdən tərkib tapmamasına deyilir. İndi də bu əsasın bə`zi dəlillərinə işarə :edək

İnsan, aləmdəki mövcudlara diqqət edərsə, onların arasında xüsusi bir nəzm-intizamın olduğunu biləcək. Halbuki, bu mövcudların tamamilə müxtəlif növlərdən təşkil olunması mə`lumdur. Mövcudlar arasında forma və növ cəhətdən ixtilaf olsa da, onların hamısı bir bədənin üzvləri kimi tamamilə bir-birinə bağlı olub, sabit bir qanun və nəzm üzrə idarə olunur. Təbiidir ki, bu vahid nəzm və xüsusi ardıcıllıq, yalnız bir :xaliqin vasitəsilə ola bilər. Necə ki, Allah-təala Qur`ani-kərimdə buyurur

---

۱- [۱۷]Şeyx Səduqun “Xilal” kitabı. ۴-cü bab, ۸۷-ci hədis.

۲- [۱۸]Nəhcül-bəlağə ۱-ci xütbə.

Onunla yanaşı heç bir tanrı yoxdur. Əgər belə olsaydı, onda hər bir tanrı əlahiddə öz“ (yaratdıqları ilə gedər və onların hər bir qismi digərinə üstün olmağa çalışardı.”(۱

(.Bununla da dünyanın nəzm-intizamı pozulardı)

Başqa sözlə desək, varlıq aləmi müxtəlif növ və şəkillərdən ibarət olsa da, eyni zamanda hamısı bir nəzm-intizama tabedir. Hər bir mövcud vahid nəzmə tabe olan halda özünün xüsusi yolunu seyr edir. Bununla da fəsad və ixtilafdan amanda qalırlar. Bütün bunlar yaradanın yeganə, vahid nəzm sahibi olmadan mümkün deyil. Allah-:təala Qur`ani-kərimdə həmin mövzuda buyurur

Əgər yerdə və göydə Allahdan başqa tanrılar olsaydı, onların (göy və yerin) ikisi də“ (fasid və xarab olardı.”(۲

Bəli! İnsan az da olsa özünə, dağda və səhrada olan canlılara, meşələr, dəniz, yer-göy, günəş, ulduzlar, gecə-gündüz, ilin fəsilləri və onlardakı nizama diqqət etsə, hamısının aləmin nəzm-intizam və yeganə yaradanı olmasına dəlalət etdiyini görər. Allah :Özünün tənha olmasına şəhadət verir

(Allah özündən başqa heç bir tanrı olmadığına şahiddir.”(۳“

:Həmçinin, Allah, Özü-özünün vahid və misilsiz olduğunu bəyan edib buyurur

De ki: O Allah birdir. Allah möhtac deyildir! O, nə doğmuş, nə də doğulmuşdur! Onun“ (heç bir tayı bərabəri, bənzəri də yoxdur.”(۴

:Əmirəl-mö`minin Əli (əleyhissalam) oğlu imam Həsənə (ə) buyurur

Oğlum! Əgər Pərvərdigarının şəriki olsaydı, onun da elçiləri sənə gələrdilər. Onun da“ ,qüdrəti və mülkünü görüb



---

.Mö`minun surəsi-۹۱[۱۹]-۱

.Ənbiya surəsi-۲۲[۲۰]-۲

.Ali-İmran surəsi-۱۸[۲۱]-۳

hərəkət və vəsflərini tanıyardın. Amma. O, Allah tənhadır. Necə ki, Özü-özünü belə (vəsf etmişdir."(١)

Bəli! Bu cahanın yaradanı tənhadır. Həkim və qüdrətlidir, varlığın bütün vücud və hərəkəti ona bağlıdır. Heç bir mövcud onun qüdrətindən xaric deyil. Rəhman, rəhim və həlimdir. Cism və maddədən təşkil olunmamışdır. Misilsiz və naməhduddur. Hər şeyə .və hamıya agahdır. Bütün aləmə əhatəsi var. Həmişə olub və olacaqdır

**(ƏDALƏT (ƏDL**

Əhli-beyt məktəbinin əqidə əsaslarından biri də Allahı "ədalət"-li tanımaqdır. Çünki, ədalət, kamal vəsflərindəndir. Allah-təala da bütün kamal vəsflərinə malik olub, hər cür nöqsan və naqislikdən pak və münəzzəhdir. Allahın işində zülm və sitəmə yer yoxdur. Ona görə ki, zülm və sitəm nalayiq vəsflərdən olub, nadanlıq, qüdrətsizlik və ehtiyacdan sərçeşmə alır. Halbuki, Allah-təala hər şeyi bilən, hər şeydə qüdrətli və heç .bir şeyə ehtiyacı yoxdur

Beləliklə, Hər bir müsəlman etiqadlı olmalıdır ki, Allah adil olub bütün işlərində ədalətə :riayət edir. Qur`ani-kərimdə oxuyuruq

Allah özündən başqa heç bir tanrı olmadığına şahiddir. Mələklər və elm sahibləri də" (.buna şəhadət verirlər. Halbuki, Allah ədalətlidir." (Yə`ni, ədalətlə hökm edir

Nəhayət, ağıl, ayələr və rəvayətlərlərdən aydın olur ki, Allah ədalətlidir. Yaratdığı nə varsa nəzm, hesab və müəyyən ölçü əsasındadır. Bütün kainatda ədalət və birlik :bərqərardı. İslam Peyğəmbəri (s) buyurur

"!Göylər və yer ədalət üzrə qurulub"

Əlbəttə, bizim bütün kainatdan xəbərimiz yoxdur və bütün mövcudları araşdırmamışıq. Buna qüdrətimiz də yoxdur. Lakin, cahanın hansı qisminə agah oluruqsa, orada nəzm, hesab və ədalət görürük. Bununla da, Yaradanın adil olmasını .anlayırıq. Beləliklə, Allah-təala həm xilqətdə və həm də qiyamət günündə ədalətlidir

Hər bir mövcudu yerli-yerində xəlq etiş, savabı və əzabı öz yerində və məsləhəti üzrə əta edəndir. Haqqın dərgahında heç bir mövcuda zülm olunmayıb və olunmaz. Azlıq, çirkinlik zərər və pislik kimi işlər bu dünya işləri ilə müqayisə də qarşıya çıxır. Onların müqabilində gözəllik, xeyir və yaxşılıq durur. Bütün aləmdə hər şey öz yerli yerində, .ədalətlə yaradılmış və hər şey mütləq xeyirdir

Allah hamını muxtar yaratmışdır. İnsana pisi və yaxşını ayırmaqdan ötrü ağıl vermişdir. Xeyir və şəri ayırmaqda ona kömək etməkdən ötrü onlara peyğəmbərlər göndərmişdir. Onlar insanlara səadət və xeyir yollarını göstərib, pisliklərdən çəkindirirlər. Bütün bunlar yerli-yerində saleh və sırf xeyirdir. Beləliklə, əgər insan xeyir yolunu qarşıya məqsəd qoyarsa, mükafata layiqdir. Allah-təala qiyamətin günündə Öz ədaləti üzrə yaxşı əməl sahibinə mükafat, günahkarlara isə öz günahına uyğun cəza verəcəkdir. Bütün bunlar eyni ədalət olub zərrə qədər də olsa zülm :sayılmır. Qur`an buyurur

)Biz qiyamət günü üçün ədalət tərəzisi qurarıq. Heç kəsə əsla haqsızlıq edilməz". (۱)"

:Ariflərin sözlərində eşidirik ki, Allah-təala buyurur

."Mən, əgər zalimdən intiqam almasam, zaliməm"

Belə olan halda, ey insan! Ey müsəlman! Ey ilk yaranış və qiyamətə inanan! Ey mükafat !və əzab olacağına inanan! Öz vəzifəni bil

### PEYĞƏMBƏRLIK

#### İŞARƏ

Keçmiş bəhslərdən aydın oldu ki, insan fitrət və təbiətində Allahı axtarır və ona yaxın olmaq əzmindədir. Ona görə də özünə haqq yolu göstərənə ehtiyac duyur. Başqa tərəfdən, Allah-təala insanın təbiətində müxtəlif meyillər, hətta, bir-birinə zidd istəklər qərar vermişdir. Əgər insanın meyillərinin mö`tədil şəklə düşməsi üçün yol göstərən olmasa və insanlar öz başına buraxılsa, təbii ki, səh:۱۶

---

.Ənbiya-۴۷[۲۴] -۱

özünü və cəmiyyəti fəsada çəkəcəkdir. Ona görə də Allahın rəhməti tələb edir ki, onlara doğru yolu göstərməkdən ötrü yol göstərənlər göndərsin. Heç də rəva deyil ki, mehriban Allah bəşərin maddi və mə`nəvi ehtiyaclarını bilə-bilə, səadət və xoşbəxtlik yolunu tanıyan halda insanı özbaşına qoysun. Buna görə də Allah-təala insanın özündən onlara yol göstərənlər tə`yin edir. Peyğəmbərlər İlahi göstərişləri səlahiyyətləri olan halda insanlara çatdırır. Beləliklə də, onlar Allahla insanlar arasında vasitə olub, həqiqət və hökmləri ondan alıb insanlara çatdırır. Həmin məqsədlə rəvayətlərə əsasən, Allah-təala dünyanın əvvəlindən insanlara yüz iyirmi dörd min peyğəmbər göndərmişdir. Onlardan beş nəfəri, "ulul-əzm"(١)ünvanı ilə təzə şəriət .sahibi olmuşlar

(Həzrəti Nuh (əleyhissalam .١

(Həzrəti İbrahim (əleyhissalam .٢

(Həzrəti Musa (əleyhissalam .٣

(Həzrəti İsa (əleyhissalam .۴

(Həzrəti Məhəmməd (s .۵

Biz onların hamısını qəbul edib, ehtiram göstəririk. Onları hər bir günah, xəta və .səhvdən pak bilirik

Həzrəti Məhəmməd ibn Abdullah (s) peyğəmbərlərin sonuncusu olub, dinlərin tamamlayıcısıdır. Özündən əvvəlki peyğəmbərlərin gətirdikləri dinləri qəbul edir. Başqa tərəfdən ən kamil və tam qanunlar gətirmişdir. Həmin səbəbə biz öz .vəzifələrimizi o həzrətdən alır və ona uyğun əməl edirik

### İSLAM PEYĞƏMBƏRININ (S) QISA HƏYATI

Həzrət Məhəmməd (s), qüreyş qəbiləsindən olub, Haşimi nəslindəndir. Atası Abdullah Əbdül Mütəllibin oğlu və Haşimin nəvəsidir. Anası Aminə xatun, bəni Zöhrə .qəbiləsindən olan Vəhəbin qızıdır. O da qüreyş qəbiləsindəndir

Abdullah evləndikdən sonra Şam ölkəsinə səfərə çıxır. Qayıdarkən Mədinədə vəfat edir və orada dəfn olunur. İslam Peyğəmbəri (s) atası Abdullahın vəfatından bir neçə ay sonra ٥٧١-ci ildə Məkkədə dünyaya göz açıb aləmi işıqlandırır. Doğulduqdan sonra Məkkə böyüklərinin adətinə əsasən, ona süd verməkdən ötrü bəni Sə`d qəbiləsindən olan Həlimə Sə`diyyəyə tapşırırlar. Dörd il Həlimənin yanında qalır. Ondan sonra anası onu alıb qohum-əqrəbası ilə görüşdürməkdən ötrü Mədinəyə aparır. Mədinədən qayıdarkən anası yolda vəfat edir. Mədinə ilə Məkkə arasında olan "Əbva" adlı məntəqədə dəfn olunur. Ondan sonra cəddi Əbdül Mütəllibin, daha sonra Əmirəl-möminin Əli (əleyhissalamın) atası Əbu Talibin himayəsində qalır. İyirmi beş yaşında qırx yaşlı Xədicə ilə ailə həyatı qurur. Qırx yaşında ikən Allah-təala tərəfindən peyğəmbərliyə seçilir. İnsan və cinnlərin qüdrəti onu gətirməyə çatmayan Qur`ani-kərim ona vəhy olunur. Allah-təala onu peyğəmbərlərin sonuncusu adlandırır və ən gözəl nümunəvi insan kimi tanıtdırır. Həzrətin dünyadakı ömrü ٦٣ il çəkir. Bu mübarək :həyatı üç qismə bölmək olar

.Ömrünün əvvəlindən peyğəmbərliyə seçilən günədək ٤٠ il .١

.Peyğəmbərliyin əvvəlindən Mədinəyə hicrət edənədək. ١٣il .٢

.Hicrətdən vəfatına qədər. ١٠ il .٣

Məşhur nəzəriyyə budur ki, İslam Peyğəmbəri (s) hicrətin ١١-ci ilində Mədinədə İlahi !rəhmətə qovuşur. Allahın salam və rəhməti Ona olsun

## PEYĞƏMBƏRI TANIMAQ YOLLARI

:Ümumiyyətlə peyğəmbərik üç yolla isbat olunur

.Peyğəmbərlik iddiası olsun

.Peyğəmbərliyə ləyaqəti olsun

.Mö`cüzəsi olsun

## BIRINCI: PEYĞƏMBƏRLIK IDDIASI

Heç kəsə gizli deyil ki, İslam Peyğəmbəri (s) ۶۱۱-ci ildə, şirk, bütpərəstlik, atəşpərəstlik və sairə.. dünyanı tutarkən Məkkədə səh:۱۸

peyğəmbərlik iddiası edir və ömrünün sonuna qədər İslam dininə də`vət edir. Bir .çoxları bu dini qəbul edib, İslam dininə gəlirlər

### İKINCI: PEYĞƏMBƏRLIYƏ LƏYAQƏTI OLMAQ

Peyğəmbərlik iddiası edən şəxs, bəyənilmiş vəsflərə, kamal sifətlərinə malik olub, ümmət içində ən fəzilətlilərindən olmalı, bütün çirkin işlər və pis əməllərdən uzaq gəzməlidir. Bütün bunlar İslam peyğəmbəri (s) barəsində dəfələrlə müxtəlif yollarla sübuta yetmişdir. Peyğəmbərin (s) dostu və düşməni onun ən yaxşı bəyənilmiş sifətlərindən xəbər vermiş, həmçinin, onu peyğəmbərliyə mane olan çirkin əməllər və .əxlaqdan pak bilmişlər

Xülasə, bəyənilmiş vəsfləri, ədəb-ərkanı, həmçinin, bəşəriyyət aləmində baş vermiş dəyişikliklər, xüsusilə, Hicaz və Ərəbistan yarmadasındakı yenilikləri vücuda gətirdi. Tövhid, Allahın vəsfləri, əhkam, halal-haram, moizələr-nəsihətlər və sair sahədəki fəaliyyəti həddən artıqdır. Bütün bu vəsflərin hər birisi onun peyğəmbərliyə layiq .olduğunu təsdiqləyir. Bu məsələdə insaflı şəxsin heç bir şəkk-şübhəsi olmamalıdır

### ÜÇÜNCÜ: MÖ`CÜZƏ GƏTIRMƏK

:Mö`cüzəni beş işdə xülasə etmək olar

;Əxlaqi mö`cüzə

;Elmi mö`cüzə

;Əməli mö`cüzə

;Mə`nəvi mö`cüzə

.Vücudun tə`siri

.İslam peyğəmbəri (s) bütün bu beş xüsusiyyətə kamil şəkildə malik idi

### BIRINCI: ƏXLAQI MÖ`CÜZƏ

İslam peyğəmbəri (s) cavan vaxtlarından sədaqətli və əmanətdar bir şəxs kimi

məşhur olmuş, səbirli, kəramətli və bağışlayan insan simasında vəsf olunmuşdur. Təvazökarlıqda misli yox idi, xoş xasiyyətlikdə bərabəri tapılmazdı. Qur`an buyurur:

(Həqiqətən, Sən böyük bir əxlaq sahibisən."(1)"

Bağışlamaq və güzəştə getməkdə tək idi. İnsanların əziyyət və istehzası müqabilində buyururdu:

"İlahi! Mənim ümmətimi Özün bağışla! Doğurdan da onlar nadandırlar!"

Həmişə mö`minlərə qarşı rəhimli, bağışlayan və mehriban di. Gülərüzlülüyü və xoşxasiyyətliliyini heç vaxt dostlarından əsirgəməzdi. Vaxtaşırı onları yoxlayır və xeyirxahlara həmişə öz yanında yer verərdi. Onun nəzərində ən üstün şəxs müsəlmanların xeyrini istəyən idi. Ən əzizi o kəslər idilər ki, əhaliyə kömək və ehsan etməkdə öndə gedirdilər. Məclislərdə yalnız, Allahın adını çəkməklə oturub-dururdu. Çox vaxt üzü qibləyə əyləşər, xüsusi yerdə oturmazdı. Müsəlmanlarla elə rəftar edirdi ki, sanki əhalinin ən hörmətlisi ilədir. Çox danışmazdı, batil söz eşitməyincə heç kəsin sözünü kəsməzdi. Heç kəsi məzəmmət etməz, əhalinin zəif cəhətlərini üzlərinə vurmazdı. Xasiyyəti hamının xasiyyətindən üstün idi. Ərəblərin və qəriblərin pis əməllərinə səbr edirdi. Yerdə əyləşər, fəqir və miskinlərlə oturub-durardı. Onlarla yemək yeyər, yemək və geyinməkdə əhalidən üstün olmazdı. Hər kəslə qarşılaşsa salam verər və ilk görüşən şəxs olardı. Heç kəsin onun müqabilində ayaq üstə durmasına icazə verməzdi. Elm, əxlaq və hörmət sahiblərinin xatirini gözləyirdi. Hamıdan hikmətli, bilikli, səbirli, adil , şücaətli və mehriban idi. Qocalara hörmət, uşaqlara mehribançılıq və qəriblərin halına riayət edərdi. Nə qədər imkanı vardısa tək yemək yeməzdi. Vəfat edərkən dirhəm və dinar irs qoymadı. Həzrətin şücati o qədər idi ki , Həzrət Əli (əleyhəssəlam) buyurur:

"Hər zaman döyüş şiddətlənsəydi peyğəmbərə pənah aparardıq!"

Əfv və bəxşişi o qədər çox idi ki, Məkkə fəth olunarkən Kə`bə evinin qapısından tutub Məkkə əhlinə xitab edərək buyurdu:

"İndi öz halınıza nə deyirsiniz? Nə fikirləşirsiniz?"

Dedilər: Yaxşı söz gözləyir və xeyir işə gümanımız var! Kəramətli qardaş və kəramətli !qardaş oğlu bizə qüdrət tapıb, hər nə istəyirsən edə bilərsən

İslam peyğəmbəri (s) bu sözləri eşitcək qəlbi riqqətə gəldi, gözlərindən yaş axmağa :başladı. Məkkə əhli də Onu görüb ağlaşmağa başladılar. O vaxt Həzrət buyurdu

:Mən o şeyi deyirəm ki, yusif qardaşım demişdi“

(Bu gün sizə [etdiklərinizə görə] heç bir məzəmmət yoxdur. Allah sizi bağışlasın!”(١)“

:Beləliklə, onların cinayətlərini bağışlayıb, cəzalarını vermir. Sonra buyurdu

”!Gedin ki, siz azad olunmuşlarsınız“

### İKINCI: ELMI MÖ`CÜZƏ

Elmi mö`cüzəni müxtəlif kitablara müraciət etməklə O Həzrətin sözlərində, .kəlmələrində, xütbələrində və nəsihətlərində aydınca görmək olar

### ÜÇÜNCÜ: ƏMƏLI MÖ`CÜZƏ

Qeyd etmək lazımdır ki, Peyğəmbərin (s) doğulduğu ilk gündən vəfatına qədər əməlləri .və rəftarı özü bir mö`cüzə idi

O həzrətin yaşadığı mühit, Hicaz əhli, onların ruhiyyələri, xüsusilə o dövrün əhalisi .barəsində azacıq fikirləşməklə onun bütün əməllərinin mö`cüzə olduğu aşkar olunar

Bəli! Tikanlar şəhərində gül bitir. Nəinki onların iyini özünə çəkmir, hətta, onların .hamısını dəyişdirir

Onların mühit və yaşayışına tabe olmamaqla bərabər, başqalarının həyat və mühitini .özünə tabe etdirir

İyirmi üç il ərzində bütün çətinliklərə və maneələrə baxmayaraq dörd böyük və əsas iş yerinə yetirir. Bu işin hər birisinin yerinə yetirilməsindən ötrü illərlə vaxt lazım idi. O :dörd iş bunlardır

Öz dövründə yayılmış dinlərin əksinə olaraq, təzə, İlahi dinin əsasını qoydu və .١ insanları öz dininə inandırdı. Belə ki, bu gün də onun ruhani nüfuzu yüz milyonlarla tərəfdarını əhatə edir. İnsanları zahirdə itaətə gətirmək asandır, amma qeydsiz-şərtsiz onların qəlblərini ələ almaq və ram etmək, səmimi qəlblə itaətkar etmək heç də !asan iş deyil. Hətta elə insanlar ki, cahil və təəssübkeş olsunlar

Bir-biri ilə düşmən olan və həmişə döyüşməkdə olub bir-birinin qanını içən müxtəlif .٢ qəbilələrdən vahid ümmət vücuda gətirib onların arasında, qardaşlıq, bərabərlik, azadlıq və həqiqi mə`nada birlik əmələ gətirir. İllərdən sonra müxtəlif millətlərdən “Məhəmməd (s) ümməti” adlı bir ümmət təşkil edir. Elə bir ümmət ki, bu gün də .qalmaqdadır və getdikcə artır

Hər biri öz-özünə rəis olan, təkəbbürə adət etmiş və əvvəldən mərkəzi hökuməti və .٣ qüdrəti olmayan müxtəlif qəbilələrin arasından elə bir dövlət təşkil edir ki, tamamilə azadlıq və müstəqillik əsasında olur. Qüdrət və nüfuz cəhətdən elə səviyyəyə gəlib .çıxır ki, bir əsrdən sonra dünyada yeganə dövlət və mütləq hökumət olur

Həzrət özü bir günün içində öz zəmanəsinin padşahlarına altı məktub yazıb hamısını İslam dininə də`vət edir. Elə padşahlar ki, özlərini ən qüdrətli sanır və ərəbləri heç hesab edərdilər. Belə ki, Həzrətin məktubu İran şahının əlinə çatır, Həzrətin adının onun adından əvvəl yazıldığını gördükdə dəhşətə gəlir və mə`murlarına göstəriş verir ”!ki, Mədinəyə gedib onu mənim yanıma gətirin

Bəli! Onlar fikirləşirdilər ki, ərəblər o kəslərdir ki, Həbəşistandan gələn kiçik qoşun müqabilində heç bir əks-əməl göstərmədilər. Məkkə şəhərini, öz evlərini və var-dövlətlərini qoyub dağa pənah apardılar. Amma, indi onlar başa düşmürlər ki, onların .İlahi rəhbəri və səmavi kitabları var. Daha onlar əvvəlki ərəblər deyillər

İyirmi üç il ərzində elə qanunlar və göstərişlər tə`yin etdi ki, bu gün və qiyamətə .۴ qədər insanların bütün ehtiyaclarına cavab verir və onlara əməl etməklə dünya və axirətdə xoşbəxtliyi ələ

gətirmək olar. Bu qanunlar heç vaxt köhnəlib gözdən düşməyəcəkdir. Necə ki, :mə`sum İmam (əleyhəssəlam) buyurur

Məhəmmədin halal etdikləri qiyamətə qədər halaldır və haram buyurduqları“ (qiyamətə qədər haramdır.”(١)

Bu qanunlar bu gün də təravətli olub həmişə elmi mərkəzlərdə böyük din alimləri .vasitəsi ilə “əməli vəzifələr” və dinin şaxələri adı ilə təhlil olunub ələ gətirilir

### DÖRDÜNCÜ: MƏ’NƏVI TƏ`SIR

Peyğəmbərin (s) əbədi mö`cüzəsi Qur`ani-kərimdir. Bu müqəddəs kitab Onun mö`cüzəsinə qəti sənəddir. O Qur`an ki, iyirmi üç il ərzində Peyğəmbərə (s) nazil olmuş və o vaxtdan bu günə kimi müxtəlif cəmiyyətlərin şəxsiyyətləri müxtəlif cəhətdən bu kitabı araşdırmışdır. Bu kitab alimlərin təəccübünə səbəb olmuş, uzun əsrlər boyu yenilməz olub öz orjinallığını hifz etmişdir. Hər cür dəyişiklik və təhrifdən amanda qalmışdır. Yüzlərlə təfsir bu kitabın sözlərinin mə`naları və həqiqətləri .barəsinə tərtib olunmuşdur

:Allah-təala Özü bu kitabın hifz olunmasına zəmanət vermişdir

Şübhəsiz ki, Qur`anı Biz nazil etdik və sözsüz ki, Biz də onu [hər cür təhrif və təbdil“ (dən; artırıb-əskiltmədən] qoruyub saxlayacağıq.”(٢)

### BEŞINCI: VÜCUDUN TƏSIRI

İslam Peyğəmbərinin (s) mö`cüzələrindən biri də onun pak nəsli və mə`sum Əhli-beytidir (əleyhəssəlam). Yə`ni, təkcə peyğəmbərlik məqamıdır ki, bəşər cəmiyyətinə o cür pak qız, Həzrət Fatimə (səlamullahi əleyha) və mə`sum İmamları (əleyhəssəlam) bəxş etmişdir. İnsaflı şəxs, Əhli-beyt (əleyhəssəlam)-ın yaşayış, elm, danışıq və əməllərinə baxanda istər-istəməz iqrar edər ki, onların hər birisi Qur`an kimi səh:٢٣

---

.Üsuli-Kafi ١-ci cild, səh. ٨[٢٨] -١

.Hicr surəsi-٩[٢٩] -٢

mö`cüzədir. Onlar da müstəqil mö`cüzə və dəlil kimi islam Peyğəmbərinin (s) peyğəmbərliyinə dəlildir. Belə ki, əgər bizim əlimizdə o həzrətin peyğəmbərliyinə heç bir dəlil olmasaydı belə, Əhli-beytin müqəddəs vücudu bizə kifayət edərdi və höccət .tamam olardı

## İMAMƏT

### İŞARƏ

Əhli-beyt (əleyhəssəlam) məktəbinin tərəfdarlarının əqidə əsaslarından biri də ."imamət" məsələsidir

Peyğəmbərlik bəhsində mə`lum oldu ki, dində imamın vücudu peyğəmbərin vücudu kimidir və peyğəmbər Allah tərəfindən tə`yin olunduğu kimi imam da peyğəmbərin canişini, dinin qoruyucusu və bəyan edəni olduğuna görə Allah tərəfindən tə`yin olunmalıdır. Müsəlmanların işləri, haqqı və qüdrəti deyil ki, peyğəmbərdən ötrü canişin tə`yin etsinlər. İnsanların qüdrətindən xaricdir ki, ilahi hökmləri və peyğəmbərin şəriətini bəyan etməkdən ötrü özləri xəlifə seçsinlər. Bu məsələnin dəlilləri həddən :artıqdır. Onlardan bə`zilərinə işarə edirik

Birinci: İşarə olunduğu kimi imamət mərtəbəsi peyğəmbərlik məqamı kimi olub onun ardınca gəlir. Beləliklə, peyğəmbərin göndərilməsinə nə cür dəlil gətirmişdiksə, imamın .tə`yin olunmasına da dəlalət edir. Xülasə, imamət də həmin dəlillərlə sübut olunur

İkinci: Hamıya aydındır ki, dinin, Qur`anın, ümmətin məsləhətlərini hər cür fəsaddan qorumaqdan ötrü imamın vücudu lazımdır. Beləliklə, ilahi rəhmət və lütfə əsasən, Allaha bu imamı tə`yin etmək lazımdır. Çünki, imamın tə`yin olunmaması, dinin məsləhətlərinin aradan getməsindən əlavə cəmiyyətdə fəsad baş verib, İslam peyğəmbərinin (s) zəhmətləri hədər olub, din, şəriət və Qur`anın unudulacağına səbəb olar. Bu da əsasən, hədəfin ziddinədir. Allahdan ötrü isə hədəfin ziddi rəva deyil .və qeyri-mümkündür

Üçüncü: İmamətin dəlillərində qeyd olunduğu kimi imam, mə`sum, insani fəzilətlərə malik, bütün çirkinliklərdən pak, səh:۲۴

ümmətin ehtiyacı olduğu bütün məsələdə alim və şübhələrə cavab verməyə qadir olmalıdır. Nəhayət, imam hər cəhətdən kamil olmalıdır. Bütün bu işlər batini məsələ olub, yalnız, Allahın batindən xəbərdar olduğunu nəzərə alsaq, Ondan başqa heç kəsin imamı tə`yin etməyə qüdrəti yoxdur. Qur`an buyurur:

“Allah peyğəmbərliyi hara [kimə] göndərəcəyini Özü daha yaxşı bilir.”(١)

İnsanların belə bir işi tə`yin etməyə qüdrətləri olmadığı kimi dəxalət etməyə də haqları yoxdur.

Allah-təala buyurur:

“Rəbbin istədiyini yaradar və [istədiyini] seçər. Onların [bəndələrin etməyə] heç bir ixtiyarı yoxdur!”(٢)

Beləliklə, peyğəmbərin canişininin tə`yini yalnız Allahın ixtiyarındadır və insanların öhdəsindən xaricdir.

Həmin əsasa görə, biz Əhli-beyt ardıcılları inanırıq ki, İslam peyğəmbəri (s) özündən sonra imamətçiliyə və rəhbərliyə on iki Mə`sum (əleyhəssəlam) tə`yin etmişdir. İslam Peyğəmbəri (s) hələ öz dövründə onların hamısını adı və nişanələri ilə ümmətinə tanıtdırmışdır.

## BIRINCI IMAM

İslam Peyğəmbəri (s) öz də`vətinin izhar və insanları islama də`vət etdiyi birinci yığıncağında özündən sonrakı canişinini tə`yin etdi və onu əhaliyə tanıtdırdı.

O həzrət (s) bes`ətin üçüncü ilinə kimi islama gizli şəkildə də`vət edirdi. Nəhayət bu ayə nazil oldu:

“Və ən yaxın qohumlarını qorxut!”(٣)

İslam Peyğəmbəri (s) qırx nəfərə yaxın qohum-əqrəbasını də`vət edir. Yeməkdən sonra buyurur:

Ən`am surəsi-۱۲۴[۳۰] -۱

.Qəsəs surəsi-۶۸[۳۱] -۲

Şüəra surəsi-۲۱۴[۳۲] -۳

Ey Əbdül Müttəlibin övladları! Ərəblərin içində elə bir cavan tanımıram ki, mənim sizə“ gətirdiyim şeydən yaxşı bir şey öz tayfasına gətirsin. Mən sizə dünya və axirət xeyiri gətirmişəm. Allah mənə göstəriş verib ki, sizi bu dinə də`vət edim. Sizlərdən kim bu ”?işdə mənə kömək göstərir, nəhayətdə məndən sonra mənim canişinim olsun

Oturanların hamısı bu işdən boyun qaçırırlar. Yalnız Əli (əleyhəssəlam) hamıdan yaşda :balaca olan halda ayağa durub ərz etdi

”...!Ey Allahın peyğəmbəri! Mən bu yolda sənə yar və yavərəm“

:Peyğəmbər (s) əlini Həzrət Əlinin (əleyhəssəlam) çiyninə qoyub buyurdu

Bu mənim qardaşım və sizin aranızda canişinimdir. Onun sözünü eşidin və göstərişinə“ ”!itaət edin

Cəmiyyət istehza edib gülən halda yerindən qalxır və Əbu Talibə dedilər: “Sənə ”!göstəriş verir ki, oğlunun əmrini eşidib ona itaət edəsən

Bu hədisi sünni alimlərinin çoxu, o cümlədən İbni Cərir, İbni Əbi Hatəm, İbni Mərduviyyə, Əbu Nəim, Beyhəqi, Sə`ləbi, Təbəri, İbni Əsir, Əbul-Fəda və başqaları öz (kitablarında nəql etmişlər.(۱

Bu hədisdən mə`lum olur ki, peyğəmbərlik və imamətə də`vət hər ikisi birlikdə olmuşdur. Mə`lum olur ki, İslam Peyğəmbəri (s) peyğəmbərliyə diqqət yetirdiyi kimi imaməti də diqqət mərkəzində saxlamışdır. Habelə, imamətsiz peyğəmbərliyi qəbul .etmək İslamın və İslam Peyğəmbərinin (s) hədəfini tə`min etmir

Bu hadisədən sonra İslam Peyğəmbəri (s) müxtəlif münasibət və fürsətlərdə Həzrət Əlinin (ə) imamətini müsəlmanlara xəbər vermişdir. Bu barədə ayələr də nazil olmuşdur. Nəhayət hicrətin onuncu ilində İslam Peyğəmbəri (s) ziyarətə gedir, həcc səh:۲۶

---

.Seyyid Şərafəddinin “Əl-Müraciət” və Şuştərinin “Eqaqul-Həqq” kitabları[۳۳] -۱

mərasimini icra edir. Bu həcc, Peyğəmbərin (s) ömrünün sonuncu ilinə təsadüf edir. Bu səbəbdən həmin həcci, “Həccətul-vida” adlandırırlar. Peyğəmbərlə (s) bu səfərdə olan .müsəlmanların sayı yüz iyirmi min nəfərə yaxın olur

### QƏDIR–XUM” HADISƏSININ XÜLASƏSI“

Həcc mərasimi qurtardıqdan sonra İslam Peyğəmbəri (s) Mədinəyə tərəf üz tutur. “Qədir Xum” adlı yerə çatanda Cəbrail-Əmin nazil olub İslam Peyğəmbərinə (s) bu yerdə dayanmasını göstəriş verir. Peyğəmbər (s) yanında olanlara dayanmaq əmrini verir. Karvan əhli isti, susuz və kölgələnəcək olmayan yerdə birdən dayanmaq əmrini eşitdikdə təəcüblənirlər. Öz-özlərinə dedilər: Sözsüz ki, Allah tərəfindən fərman gəlib, :bu vaxt ayə nazil olur

Ya Peyğəmbər! Rəbbin tərəfindən sənə endirilmiş olanı tamamilə [insanlara] çatdır.“ Əgər [bunu] etməsən, Allahın risalətini [sənə həvalə etdiyi elçilik, peyğəmbərlik vəzifəsinin] yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyacaq. Allah kafir (camaatı düz yola yönəltməz!”(١

Azançı müsəlmanları zöhr namazına çağırdı. Zöhr namazından sonra İslam Peyğəmbəri (s) ümmətini İlahi xəbəri eşitməyə də`vət edir. Dəvə yəhərlərindən mənbər düzəlir. Peyğəmbər (s) mənbərə çıxıb, Allaha həmd və səna deyəndən sonra :buyurdu

Mən tezliklə sizin aranızdan gedəcəyəm. Mənim də məs`uliyyətim var sizin də. ......“ ”!İndi baxın görək sizin aranızda qoyub getdiyim iki qiymətli yadigarla nə edəcəksiniz



---

.Maidə surəsi-۶۷[۳۴] -١

”!Bir nəfər cəmiyyətin içindən səslənir: Hansı iki qiymətli yadigar? Ya Rəsuləllah

:Həzrət (s) buyurdu

Böyük qiymətli yadigar Allahın kitabıdır. Bir tərəfi Allahın, digər tərəfi isə sizin“ əlinizdədir. Zəlalətə düşməməyinizdən ötrü Ondan əl götürməyin. Amma, ikinci qiymətli yadigarım Əhli-beytimdir. Allah-təala mənə xəbər vermişdir ki, bu iki şey behiştdə qovuşana qədər bir-birindən ayrılan deyil. Bu iki şeydən qabağa düşməyin, ”.yoxsa həlak olarsınız. Arxada da qalmayın ki, yenə həlak olarsınız

Birdən əhali görür ki, İslam Peyğəmbəri (s) ətrafına göz gəzdirir. Həzrət Əlini (ə) görcək əyilib əlindən tutub qaldırır. Belə ki, hər iki qoltuğunun altı görünür. Hamı onu :görüb tanıyır. Bu halda İslam Peyğəmbəri (s) uca səslə buyurur

”?O kimdir ki, müsəlmanların yanında özlərindən də üstündür“

!Dedilər: Allah və Onun peyğəmbəri (s) üstündür

:Peyğəmbər (s) buyurdu

Allah mənim mövlam və rəhbərimdir. Mən də mö`minlərin rəhbəri və mövlasıyam.“ [Sonra buyurur:] Hər kəs ki, mən onun mövla və rəhbəriyəm, Əli də onun mövla və ”!rəhbəridir

:Bu sözləri üç-dörd dəfə təkrarlayır. Sonra buyurur

İlahi! Onun dostlarını dost tut! Düşmənini düşmən bil. Hər kəs onu sevsə Sən də onu“ sev. Hər kəs onu düşmən tutsa Sən də onu düşmən tut. Dostlarına kömək et. O kəslər ki, ona kömək etməzlər, sən də onlara kömək etmə. Həmişə haqqı onunla et və onu ”!heç vaxt haqdan ayırma

Həzrətin xübtəsi (biz onun qısasını ərz etdik) sona yetdi. Bu vaxt aşağıdakı ayə nazil :oldu

səh:۲۸

Bu gün dininizi tamamlayıb mükəmməl etdim. Sizə olan ne`mətimi başa çatdırdım və“ (bir din kimi sizin üçün İslamı bəyənib seçdim.”(١)

Bu vaxt sək-küy ətrafı bürüyür. Həzrət Əmirəl-mö`minin Əliyə (ə) təbrik deyirdilər. Əbu Bəkr və Ömər də əhalinin gözü önündə Əmirəl-mö`minin Əliyə (ə) xitab edərək :dedilər

Mübarək olsun! Mübarək olsun! Ey Əbu Talibin oğlu! Sən, mənim və bütün imanlı kişi“ ”!və qadınların rəhbəri və mövlası oldun

Həmçinin, İslam Peyğəmbəri (s) xütbəsindən sonra Həsan ibni Sabit adlı şair icazə alıb .o Həzrətə şe`r də dedi

Qədir Xum” hadisəsinin qısa məzmunu bu idi. Şiə alimlərindən əlavə, sünnü alimlərinin“ əksəriyyəti bu hadisəni öz kitablarında nəql etmişlər. Nümunə üçün onlardan bir :dəstəsinin adını qeyd edirik

Hafiz Əbu Səid Səcistani, Əbu Nəim İsfahani, Əbul Həsən Vahidi Nişaburi, İbni Əsakir“ Şafei, Fəxr Razi, Həmviyni, İbni Səbbağ Maliki, Cəlaləddin Süyuti, Alusi, Qunduzi, (Bədrəddin Hənəfi, Şeyx Məhəmməd Əbdəh Misri və bir çoxları....”(٢)

Qeyd etmək lazımdır ki, bütün bu sünni alimləri “Qədir Xum” hadisəsini nəql etmələrinə baxmayaraq, ya qorxudan, ya mühit və mövqelərinə görə ya da təəssübkeşlik .üzündən hadisəni müxtəlif yerə yozub çox əhəmiyyətli nəzərə almamışlar

!Allah onları öz istədikləri və biz də öz istədiyimiz kimsələrlə məhşur eləsin! İnşaallah

Bununla belə, əgər “Qədir Xum” hadisəsini görməməzliyə vursalar da İslam Peyğəmbərinin (s) ilk aşkar də`vəti zamanı dediyi sözlər, “iki qiymətli yadigar” hədisi, həmçinin, başqa hədislər ki, Əmirəlmö`minin Əli (əleyhəssəlam) və başqa



---

١- [٣٥]-٣Maidə surəsi.

٢- [٣۶]Əllamə Əmininin “Əl-qədir” kitabı.

mə`sumların (əleyhəssəlam) imamətləri barəsində, əhli-sünnət alimlərinin söylədikləri hədislər bu məsələni sübuta yetirir. Bu hədislər o qədərdir ki, heç bir qaçmaq yolu :olmamaqla yanaşı, onlara göz yummaq da olmaz. Qur`an buyurur

Allah olacaq işi yerinə yetirmək üçün belə etdi ki, həlak olan aşkar bir dəlillə həlak“ (olsun, sağ qalan da aşkar bir dəlillə sağ qalsın.”(١

Yerdə qalan on bir mə`sum İmamların (əleyhəssəlam) mübarək adları tərtiblə :bunlardır

:Əlidən (ə) sonra

ci həzrət imam Həsən Müctəba (ə). Hicrətin ٣-cü ilində doğulmuş və ٥-ci ilində-٢ .şəhadət məqamına çatmışdır. Dəfn olunduğu yer Mədinə, Bəqi qəbristanlığı

cü həzrət imam Hüseyn ibni Əli (əleyhəssəlam). Ləqəbi Seyyidüşşühəda. Hicrətin ٤—٣ .cü ilində doğulub, ٦١-ci ilində Kərbəlada şəhadətə çatıb

cü həzrət imam Əli ibni Hüseyn (əleyhəssəlam). Ləqəbi Zeynülabidin. Hicrətin ٣٨-ci-٤ ilində doğulub, ٩٤-cü ilində vəfat etmişdir. Dəfn olunduğu yer: Mədinə, Bəqi .qəbristanlığı

ci həzrət imam Məhəmməd ibni Əli (əleyhəssəlam). Ləqəbi Baqirül-ulum. Hicrətin ٥٧--٥ ci ilində doğulub, ١١٤-cü ilində vəfat etmişdir. Dəfn olunduğu yer Mədinə, Bəqi .qəbiristanlığı

cı həzrət imam Cə`fər ibni Məhəmməd (əleyhəssəlam). Ləqəbi Sadiq. Hicrətin ٨٣-cü-٦ ilində doğulub, ١٤٨-ci ilində vəfat etmişdir. Dəfn olunduğu yer: Mədinə, Bəqi .qəbristanlığı

ci həzrət imam Musa ibni Cə`fər (əleyhəssəlam). Ləqəbi Kazim. Hicrətin ١٢٨-ci ilində-٧ .doğulub, ١٨٣-cü ilində şəhadət məqamına çatmışdır

ci həzrət imam Əli ibni Musa (əleyhəssəlam). Ləqəbi Riza. Hicrətin ١٤٨-ci ilində-٨ .doğulub, ٢٠٣-cü ilində şəhadət məqamına çatmışdır

cu həzrət imam Məhəmməd ibni Əli (əleyhəssəlam). Ləqəbi Cavad. Hicrətin ۱۹۵-ci-۹ .ilində doğulub, ۲۲۰-ci ilində şəhadət məqamına çatmışdır

cu həzrət imam Əli ibn Məhəmməd (əleyhəssəlam). Ləqəbi Hadi. Hicrətin ۲۱۲-ci-۱۰ .ilində doğulub, ۲۵۴-ci ilində şəhadət məqamına çatmışdır

ci həzrət imam Həsən ibni Əli (əleyhəssəlam). Ləqəbi Əsgəri. Hicrətin ۲۳۲-ci ilində-۱۱ .doğulub, ۲۶۰-cı ilində vəfat etmişdir

ci həzrət imam Höccət ibni Həsən Əlməhdi (ə.c) Hicrətin ۲۵۵-ci ilində doğulub. Hal—۱۲ hazırda sağdır. Gözlərə görünmür. Günlərin birində Allahın əmri ilə zühur edib bütün dünyanı ədalət nuruna qərq edəcəkdir. Dünyada ədalətli hökumət quracaq. (Allah (!zühurunu tezləşdirsin

Həmçinin, qeyd etmək lazımdır ki, biz şiələr inanırıq ki, İslam Peyğəmbərinin (s) əziz qızı, Əmirəlmö`minin Əli (əleyhəssəlam)-ın zövcəsi, imamların anası Həzrət Fatimə (salamullahi əleyha) imamət və vilayətdə böyük rol oynamışdır. Hər iki dünyada qadınların başçısı Həzrət Fatimə (salamullahi əleyha) bütün zamanlarda bütün insanların ən böyük nümunəsidir. Mə`sumlardan biri olduğuna görə onun sözü, əməli və susmağı bizim üçün dəlildir. Onun razılığı Allah və Peyğəmbərin (s) razılığı, qəzəb və əziyyəti isə Allah və Peyğəmbərin (s) qəzəb və əziyyətidir. Adlarını çəkdiyimiz bu şəxslər islam Peyğəmbərinin (s) itrəti və Əhli-beyti adlanır. Onların hamısı Peyğəmbərin (s) sifətlərinə malikdir. İslam Peyğəmbəri (s) və həzrət Əli (ə) dəfələrlə :onları tapşırmış, Qur`anla birlikdə qərar verib əhaliyə xitab edərək buyurur

Mən sizin aranızda iki qiymətli yadigar qoyub gedirəm: Allahın kitabı və əhli-beytim." (Nə qədər ki, bu iki şeydən yapışmısınız zəlalətə düşməzsiniz."(۱

:Allah-təala onların öhdəsinə iki ağır məs`uliyyət qoymuşdur



---

.Biharül-ənvar, ۵-ci cild, səh. ۶۸[۳۸] -۱

Birinci: İnsanlara rəhbərlik, doğru yol göstərmək, Allah tərəfindən olan ilhamlar, İslam Peyğəmbərinin (s) qanunu və Qur`anın mətni vasitəsi ilə insanları maarif, əxlaq, .dünya və din qanunları ilə tanış etmək

İkinci: Siyasi rəhbər, cəmiyyətin idarəsi və bütün zəminələrdə İslam hökumətinin .hökmlərini və qanunlarını dəqiq icra etmək

## HƏZRƏT MƏHDI (Ə.C) BARƏSINDƏ RƏVAYƏTLƏRIN MƏCMUƏSI

Münasib olardı ki, şiə və sünni alimlərinin vasitəsi ilə Həzrət Məhdi (ə.c) barəsində nəql :olunan rəvayətlərin statiskasına diqqət edək

İmamların on iki nəfər olub əvvəli Əli (əleyhəssəlam) və axırıncısı Məhdi (ə.c). ۱ .olduğunu bəyan edən rəvayətlər: ۹۱ hədis

.Həzrət Məhdinin (ə.c) Peyğəmbərin (s) nəslindən olması: ۳۸۹ hədis .۲

.Həzrət Məhdi (ə.c) Əli (əleyhəssəlam) nəslindəndir: ۲۱۴ hədis .۳

.Həzrət Məhdi (ə.c) Fatimeyi-Zəhranın (s) övladlarındandır: ۱۹۲ hədis .۴

.İmam Hüseynin (əleyhəssəlam) doqquzuncu övladındandır: ۱۴۸ hədis .۵

.İmam Səccadın (əleyhəssəlam) nəslindəndir: ۱۸۵ hədis .۶

.İmam Həsən Əsgərin (əleyhəssəlam) oğludur: ۱۸۸ hədis .۷

.Sonuncu və on ikinci imamdır: ۱۳۶ hədis .۸

.Dünyaya gəlmişdir: ۲۱۴ hədis .۹

.Uzun zaman qeybdə olacaq: ۹۱۶ hədis .۱۰

.Zühur edəcək: ۶۵۷ hədis .۱۱

.Məhdi (ə.c) dünyanı ədalətlə dolduracaq. ۱۲۳ hədis .۱۲

.İslam dini Onun əli ilə dünyaya yayılacaq: ۴۸ hədis .۱۳

## (MƏAD (QIYAMƏT

Bütün İlahi dinlərin və səmavi kitabların qəbul etdiyi əqidə əsaslarından biri də ruhun bədənə qayıtması və axirət aləmidir. Bu mə`nada ki, insanın həyatı ölümlə sona yetmir, bəlkə bu dünyadan başqa bir dünya var ki, insanlar orada xeyir və şər .əməllərinin mükafatını və cəzasını alacaqlar

:Allah-təala Qur`anda buyurur

O gün insanlar əməllərinin özlərinə göstərilməsi üçün [qəbirlərindən məhşərə] dəstə-“ dəstə çıxacaqlar! Kim [dünyada] zərrə qədər yaxşı iş görmüşdürsə onun xeyirini )görəcəkdir. Kim zərrə qədər pis iş görmüşdürsə onun zərərini görəcəkdir.”(١

Bəli! İnsanın tüğyanedici nəfsini şərdən və başqalarının hüququna təvacüzdən qoruyan bir şey varsa qiyamətə e`tiqaddır. Bəşəri şəhvət bataqlığından, fahişəlikdən və pis işlərdən çəkindirən yalnız, hesab-kitab gününü qəbul etməkdir. Bəşərin əməllərini gizlin və aşkarda nəzarətdə saxlayan polis, qiyamət və cəza gününə e`tiqaddır. Qur`ani-kərimdə hər yerdə iman və mö`minlərin vəzifəsindən bəhs olunur. İmanın əsas kökünü iki şey üstündə (Yaradana və qiyamətə e`tiqadda) möhkəmləndiyini qeyd edir. Bu işdə tələb olunan məsələ isə təqvalı olub saleh əməllər .yerinə yetirməkdir

Qiyamətə e`tiqadın müqəddiməsi, yaradana etiqadlı olmaqdır. Hər kim Yaradana iqrar edirsə, qiyamətin təsdiqi sözsüzdür. Bu əsasla, bütün İlahi dinlər və hər hansı bir .peyğəmbərdən tərəfdarlıq edənlər qiyaməti qəbul edirlər

Ümumiyyətlə, Qur`an və rəvayətlərdən ələ gələn əqli və nəqli dəlillər göstərir ki, qiyamət zəruridir. Hər kəs Allahı qəbul edirsə, qiyaməti, yə`ni, yenidən dirilib hesab-kitab, savab və əzab, behişt və cəhənnəmin olacağını da qəbul edir. Qeyd etdiyimiz kimi ayə və rəvayətlər, Allaha iman gətirməyi qiyamətin müqəddiməsi bilirlər. .Yaradana və qiyamətə e`tiqad birlikdə olub bir kök üstündə möhkəmlənmişdir



---

Zəlzələ surəsi-٥-٨[٤٠] -١

Beləliklə, o dəlillər ki, bizi dinin dörd əsaslarını qəbul etməyə vadar edir, qəti şəkildə qiyamətin də qəbul edilməsinə əsas verir. Həmin dəlillərə əsasən, qiyaməti də qəbul .edib onu Allahın eyni hikmət və ədaləti bilirik

Bura kimi bizim dini e`tiqadımızın xülasəsi idi. Onlarla geniş şəkildə tanış olmaqdan ötrü, həmçinin, başqa dini maarifləri bilməkdən ötrü geniş şəkildə yazılmış izahlı :kitablara müraciət edə bilərsiniz. Həzrət Əli (əleyhəssəlam) buyurur

Dinin əvvəli onu tanımaqdır. Mə`rifətin kamalı Allahın zatını tədsiq etməkdir. İlahinin“ təsdiqinin kamalı Onun yeganəliyinə şəhadət verməkdir. Allahın yeganəliyinə şəhadət ”.verməyin kamalı ixlasdır

İlahi! Özünü mənə tanıtdır. Həqiqətən, əgər Özünü mənə tanıtdırmasan Rəsulunu tanıya bilmərəm. İlahi! Öz Rəsulunu mənə tanıtdır. Həqiqətən, əgər Öz Rəsulunu mənə tanıtdırmasan höccətini tanıya bilmərəm. İlahi! Öz höccətini mənə tanıtdır. Əgər !höccətini mənə tanıtdırmasan dinimdə azaram

İlahi! Məhəmməd (s) və Əhli-beyt (ə) xatirinə bizim işlərimizin aqibətini xeyir elə! Onların hamısına salam və salavat göndər! Düşmənlərinə isə qiyamətə qədər lə`nət !et! Amin

بِسمِ الله الرحمن الرَّحِيم

اَلحَمـدُ لِله رَبِّ العالَمِينَ وَالصَّلوةُ وَالسَّلَامُ عَلَى سَـيِّدِنَا وَنَبِيِّنَا أَبِى القاسِمِ مُحَمَّدٍ وَآلِهِ الطاهِرِينَ وَلَعنَهُ الله عَلَى أَعدَائِهِم أَجمَعِينَ إِلَى يَومِ الدِّين

.(Bu şərif risaləyə əməl etmək, inşallah, müczidir (əməllərin düzgün olmasına kifayətdir

## ƏHKAM

### ÖN SÖZ

Bir işin həyata keçirilməsinə, başqa işdən əl götürülməsinə dair insanların vəzifələrini .müəyyənləşdirən İslamın əməli göstərişlərinə “əhkam” deyilir

İnsanın edəcəyi hər bir işin İslamda özünəməxsus hökmü vardır. Bizim işlər müqabilində vəzifəmizi müəyyən edən hökmlər beş növdür: vacib, haram, müstəhəb, .məkruh, mubah

Vacib-görülməsi lazım (ilzami), tərk olunması isə ilahi əzaba səbəb olan əməldir .((namaz, oruc və s. kimi

Haram-tərk edilməsi lazım (ilzami), görülməsi isə ilahi əzaba səbəb olan əməldir (yalan .(danışmaq, zülm etmək və s. kimi

Müsətəhəb-görülməsi yaxşı, savabı olan, lakin tərk edilməsi ilahi əzaba səbəb .(olmayan əməldir (salam vermək, sədəqə və s. kimi

Məkruh-tərk edilməsi yaxşı və savablı, lakin görülməsi ilahi əzaba səbəb olmayan .(əməldir (xörəyi üfürmək, qaynar xörək yemək və s. kimi

Mübah-görülməsi və tərk edilməsi eyni dərəcədə olan əməldir. Onun savabı yoxdur, .ilahi əzaba da səbəb olmur

səh:٣٥

## İCTİHAD VƏ TƏQLİD

İnsan dini hökmlərə iki yolla: ya “ictihad” ya da “təqlid” yolu ilə əməl edə bilər. “İctihad” din hökmlərini, onun lazımı qaynaqlarından, xüsusilə bu qaynaqların ən mühümü olan Qur’an və mə’sumların (əleyhimüssalam) hədislərindən çıxarmaq, istinbat etmək üçün aparılan axtarışlara, sə’ylərə deyilir. Bu istinbat, dini hökmlərin əxz edilməsinə köməkçi ola biləcək bir sıra elmləri öyrənəndən sonra mümkün ola bilər. Belə bir elmi .bacarığa malik olan insan müctehid adlanır

Təqlid lüğətdə “bir kəsin ardınca getmək” mə’nasındadır. Burada isə müctehidə tabe olmaq, yə’ni öz əməllərini onun fətvasına uyğun şəkildə yerinə yetirmək mə’nasını .daşıyır

Məsələ:١. İnsanların təqlid etdiyi müctehidə “mərcəyi təqlid”, o müctehidə təqlid edən .hər bir insana isə müqəllid deyilir

Məsələ:٢. Müctehid olmayan və ilahi hökmləri, göstərişləri lazımi mənbələrdən əldə edə bilməyən hər bir şəxs müctehidə təqlid etməlidir. Yə’ni öz əməllərini onun .fətvasına əsasən yerinə yetirməlidir

Məsələ:٣. Xalqın əksəriyyətinin dini hökmlərə əməl etməkdə vəzifəsi təqlid etməkdir. .Çünki, əhkamda ictihad dərəcəsinə çata bilən şəxslər həmişə az olur

:Məsələ:۴. Xalqın təqlid edəcəyi müctehid

;Adil olmalıdır ❈

;Diri olmalıdır ❈

;Kişi olmalıdır ❈

;Baliğ (həddi-büluğa çatan) olmalıdır ❈

;Aqil olmalıdır ❈

;Halalzadə olmalıdır ❈

;İmam şiəsi olmalıdır ١٢ ⁕

.Ə'ləm (başqalarından daha bilikli) olmalıdır ⁕

Məsələ:٥. Əgər bir kəsin təqlid etdiyi müctehid dünyadan getsə, bu halda onun mərcəyi-təqlidi ə'ləm olarsa, ona təqlid etməkdə qalmalıdır; yox, əgər hər iki müctehid ,(sonradan təqlid etmək istədiyi və vəfat edən müctehid) elmdə bərabər olsalar

meyyitə təqlid etməkdə qalmaq caizdir. Bu halda diri müctehidə təqlid etməyə .başlamaq işkal məhəllidir

Məsələ:۶. Ə'ləm–əhkamı (onun mənbələrindən istifadə etməklə) tədqiq və izah .etməkdə, başqa müctehidlərdən daha artıq bilikli, bacarıqlı olan kəsdir

:Məsələ:۷. Müctehidi və ə'ləmi üç yolla tanımaq olar

İnsanın özü (bir kəsin ə'ləm olmasına) yəqin etsin və ya xatircəmlik tapsın; Məsələn, ⁕ .şəxsin özü elm əhli və bu sahədə mütəxəssis olub ə'ləm müctehidi tanıya bilsin

Ə'ləm müctehidi başqalarından seçə bilən iki adil və alim şəxs hər hansı bir ⁕ müctehidin ə'ləm olmasını təsdiq etsinlər; bu şərtlə ki, başqa iki alim və adil şəxs .onların dedikləri ilə müxalifət etməsin

Bir müctehidin ə'ləm olması camaat arasında o qədər məşhur olsun ki, insan üçün ⁕ .yəqinlik, yaxud xatircəmlik hasil olsun

:Məsələ:۸. Müctehidin fətvasını əldə etməyin yolları

;Müctehidin özündən eşitməklə ⁕

;İki nəfər adil şəxsdən eşitməklə ⁕

;Sözündən yəqinlik hasil olan bir nəfərdən eşitməklə ⁕

.Müctehidin, düzlüyünə yəqin olunan risaləsini görməklə ⁕

Məsələ:۹. Müctehidin hər hansı məsələ barəsində rə'yi dəyişdikdə müqəllid yeni fətvaya əməl etməlidir. Əvvəlki fətvaya yalnız ehtiyatla müvafiq olan halda əməl .etmək olar

.Məsələ:۱۰. İnsanın əksər hallarda ehtiyac duyduğu məsələləri öyrənməsi vacibdir

## MÜSTƏHƏB EHTİYAT VƏ VACİB EHTİYAT ARASINDAKI FƏRQ

Məsələ:۱۱. Müstəhəb ehtiyat həmişə fətva ilə yanaşıdır. Yə'ni bu məsələdə müctehid

öz nəzərini deməklə yanaşı ehtiyat yolunu da göstərir. Müqəllid bu məsələdə həm fətvaya, həm də ehtiyata uyğun əməl edə bilər. Amma başqa müctehidə müraciət edə bilməz. Bu məsələ kimi: “Nəcis qabı bir dəfə kürr suda yuyanda pak olur. Amma ehtiyat ”.budur ki, üç dəfə yuyulsun

Vacib ehtiyat fətva ilə yanaşı deyildir və müqəllid elə ona əməl etməlidir. Amma başqa müctehidə də müraciət edə bilər. Bu məsələ kimi: “Ehtiyat budur ki, üzüm yarpağı təzə olarsa ona səcdə edilməsin.”

## TƏHARƏT

Bədənin və yaşayış mühitinin paklığı məsələsi islamda böyük əhəmiyyətə malikdir. İnsan nəcis şeyləri yeyib-içməkdən pərhiz etməlidir. Onun bədəni və libası aləmin Pərvədigarına pərəstişin ən gözəl təzahür ifadəsi olan namazda pak olmalıdır. Yaxşısı budur ki, insan namaz vaxtı libasının ən təmizini geyinsin. Buna görə də nəcis şeyləri tanımaq və onları pak etməyin yollarını öyrənmək lazımdır.

Məsələ:١٢. Dünyada hər şey pakdır. Yalnız ١١ şey nəcisdir və onlarla təmasdan pak şeylər də nəcis olur.

Məsələ:١٣. Nəcis şeylər aşağıdakılardan ibarətdir:

١-sidik (bovl);

٢-nəcis (qait);

٣-sperma (məni);

٤-ölmüş və ya qeyri-şər’i yolla kəsilmiş heyvan (murdar);

٥-qan;

٦-it;

٧-donuz;

٨-şərab;

٩-pivə;

١٠-kafir;

١١-nəcasət yeyən dəvənin təri.

Məsələ:۱۴. İnsanın, habelə əti haram olan və damarı kəsiləndə qanı sıçrayan .heyvanların bovl və qaiti nəcisdir

Məsələ:۱۵. Heyvanlar iki dəstədirlər: bə’zilərinin damarını kəsəndə qan təzyiqlə, .sıçrayışla çıxır. Bə’zilərinin isə damarını kəsəndə qan sıçramır, təzyiqlə çıxmır

Məsələ:۱۶. İnək, qoyun və s. kimi əti halal olan heyvanların, habelə qanı sıçramayan .heyvanların (ilan, balıq və s. kimi) bovl və qaiti pakdır

Məsələ:١٧. Əti məkruh olan heyvanların (at, ulaq və s. kimi) bovl və qaiti pakdır.

Məsələ:١٨. Əti haram olan quşların (qarğa kimi) ifrazatı pakdır.

## MURDARIN HÖKMLƏRİ

Məsələ:١٩. Şəriət qaydalarına uyğun kəsilməyən və ya özü ölmüş heyvana murdar deyirlər.

Məsələ:٢٠. Qanı sıçramayan heyvanların (balıq kimi) ölüsü pakdır.

Məsələ:٢١. Qanı sıçrayan murdar heyvanın bədəninin ruhsuz hissələri (buynuz və tük kimi) pak, ruhu olan hissələri isə (ət və dəri kimi) nəcisdir.

Məsələ:٢٢. Quruda yaşayan it və donuzun bütün hissəsi–istər diri, istərsə də ölü olsun–nəcisdir.

Məsələ:٢٣. Ölü insanın–hərçənd təzə ölüb bədəni soyumamış olsa da–dırnaq, tük və diş kimi ruhsuz hissələrindən başqa bədəninin hər yeri nəcisdir.

Məsələ:٢٤. Əgər meyyitə qusl verilsə bədəni pak olar.

Məsələ:٢٥. Allah yolunda və İslamın qorunması yolunda vuruşan bir kəs əgər müharibə və döyüş meydanında öldürülsə bədəni pakdır, qusl və kəfənə ehtiyacı yoxdur.

## QANIN HÖKMLƏRİ

Məsələ:٢٦. İnsanın və damarı kəsildikdə qanı sıçrayan heyvanların (qoyun, toyuq və s. kimi) qanı nəcisdir.

Məsələ:٢٧. Sıçrayan qanı olmayan heyvanların (balıq, ağcaqanad və s. kimi) qanı pakdır.

Məsələ:٢٨. Ehtiyat vacibə görə yumurtanın içində olan qan nəcisdir. Amma əgər qan yumurtanın sarısında olsa, nə qədər ki, onun üzərindəki nazik pərdə deşilməyib yumurtanın ağı pakdır.

Məsələ:۲۹. Dişlərin dibindən gələn qan, ağız suyu ilə qarışıb aradan getsə, pakdır. Belə olan halda ağız suyunu udmağın eybi yoxdur.

## ?PAK ŞEY NECƏ NƏCİS OLUR

Məsələ:۳۰. Əgər pak şey hər hansı nəcislə təmasda olsa və onlardan biri digərinə .sirayət edə biləcək tərzdə yaş olsa, pak şey nəcis olar

Məsələ:۳۱. Əgər insan pak şeyin nəcis olub-olmamasını bilməsə, o şey pakdır. Bu barədə axtarış aparmaq lazım deyildir–hərçənd pak və ya nəcis olduğunu başa düşə .bilərsə də

.Məsələ:۳۲. Nəcis şeyi yemək və içmək haramdır

(Mütəhhirat (PaK edən şeylər

:Məsələ:۳۳. Mütəhhirat nəcis şeyləri pak edər. Pakedicilərin ümdəsi aşağıdakılardır

;su-۱

;yer-۲

;günəş-۳

;İslam-۴

.(nəcasətin eyninin aradan qaldırılması (bunların izahı sonra gələcək-۵

## SULARIN HÖKMLƏRİ

Suyun müxtəlif növləri vardır. Onları tanımaq, onlara aid olan məsələləri .öyrənməyimizə kömək edir

:Məsələ:۳۴. Su ya muzaf, ya da saf olar

.Mütləq su–muzaf olmayan sudur

:Məsələ:۳۵. Muzaf su

Çirkili şeyi təmiz edə bilər, amma nəcis şeyi pak etməz (və bu cür su pakedici ۞ .(sayılmaz

Əgər nəcasətlə təmasda olsa, hətta əgər nəcasət az da olsa və suyun rəngi, iyi və ❊
.dadı dəyişməsə də nəcis olar

.Onunla dəstəmaz və qusl batildir ❊

## MÜTLƏQ SUYUN HÖKÜMLƏRİ

:Məsələ:۳۶ Su

,ya yerdən qaynayır

,ya göydən yağır

.ya da nə yerdən qaynayır, nə də göydən yağır

.Göydən yağan suya yağış suyu deyilir

Yerdən qaynayan su (kəhriz, artezian və bulaq suyu kimi) cərəyanda olarsa ona axar .su, cərəyanda olmazsa quyu suyu deyilir

Əgər su yerdən qaynamazsa və göydən yağmazsa sonrakı məsələdə deyiləcək .miqdarda olsa ona kürr, o miqdardan az olsa “qəlil” (az su) deyilir

Məsələ:۳۷. Bir qabın eni, uzunluğu və hündürlüyü üç qarış yarım olsa və həmin qab su .ilə doldurulsa, yaxud suyun çəkisi ۳۷۷,۴۱۹ kq-dan az olmasa ona kürr su deyilir

## QƏLİL (AZ) SU

Məsələ:۳۸. Az su sadəcə olaraq nəcis şeyə toxunmaqla nəcis olar. Amma təzyiq altında nəcisə toxunsa onda nəcasətə toxunan hissə və ondan sonrakı hissələr nəcis olar. Yuxarıdan nəcis şeyin üstünə tökülən az su kimi. Belə ki, o nəcis şeyə toxunan hissə .nəcis, nəcis şeyə çatmayan və qabın içindəki su isə pakdır

Məsələ:۳۹. Kürr, yaxud axar su, nəcis olmuş az suya birləşsə pak olur. Ehtiyat vacib budur ki, kürr, yaxud axar su onunla qarışsın. (Məsələn, əgər nəcis olmuş az suyun qabını kürr suyunun mənbəyinə birləşik olan krantın altında qoyub suyu açsalar və su ona qarışsa pak olar.) Lakin əgər su nəcasətin rəngini, dadını, iyini özünə götürsə, .onunla o qədər qarışmalıdır ki, nəcasətin iyi, rəngi və ya dadı aradan getsin

## KÜRR, AXAR VƏ QUYU SULARI

Məsələ:۴۰. Az su istisna olmaqla bütün saf sular nəcasətin rəngi, iyi və ya dadını özünə

götürməyincə pakdır. Əgər nəcasətə toxunmaq nəticəsində nəcasətin rəngini, iyini və ya dadını səh:۴۱

götürərsə nəcis olur. (Deməli, bu hökmdə axar su, quyu, kürr və hətta yağış suyu da .(.müştərəkdir

.Məsələ:۴۱. Binaların su borusu kürr su mənbəyinə birləşərsə axar su kimidir

:Məsələ:۴۲. Yağış suyunun bə'zi xüsusiyyətləri

Əgər yağış, üstündə nəcasətin eyni olmayan(۱)nəcis şeyə, yaxud nəcis yerə bir dəfə ⁕ .yağsa, pak olar

Əgər yağış nəcis palaz və paltarın üzərinə yağarsa onu pak edər. Sıxmaq da lazım ⁕ .(ilzami) deyildir

.Nəcis olmuş torpağın üzərinə yağarsa, onu pak edər ⁕

Əgər yağış suyu bir yerdə yığılsa, hətta onun miqdarı kürr sudan az da olsa, yağış ⁕ yağan halda nəcis bir şeyi orada yusalar, nə qədər ki, nəcisin rəngini, iyini və ya dadını .özünə almayıb, o su pakdır

## ?NƏCİS ŞEYLƏRİ NECƏ PAK EDƏK

### İŞARƏ

Məsələ:۴۳. Nəcis şeyləri pak etmək üçün əvvəlcə nəcasətin eynini aradan qaldırmaq, sonra isə gələcək məsələlərdə qeyd edəcəyimiz qaydaya əsasən onu suya çəkmək .lazımdır

Məsələ:۴۴. Nəcis qabı, nəcasətin eynini aradan qaldırdıqdan sonra kürr suda bir dəfə .suya çəkmək kifayətdir. Amma az su ilə üç dəfə yumaq lazımdır

:Məsələ:۴۵. Nəcis qabları aşağıdakı kimi suya çəkmək olar

;Kürr suda: onu bir dəfə suya salıb sonra çıxartmaq lazımdır ⁕

Az su ilə: üç dəfə su ilə doldurub sonra boşaltmaq, yaxud üç dəfə içinə bir qədər su ⁕ töküb hər dəfə də suyu elə hərəkət etdirmək lazımdır ki, nəcis yerlərə çatsın. Sonra isə .içindəki suyu çölə tökmək lazımdır

Məsələ:۴۶. Xalça, paltar və bu kimi suyu özünə hopduran və sıxıla bilən şeyləri az su ilə paklayanda hər dəfə yuyandan sonra sıxmaqla, yaxud başqa yolla daxilindəki su .çıxarılmalıdır. Ehtiyat vacibə görə, kürr və axar su ilə yuyanda da sıxmaq lazımdır



---

(Nəcasətin eyni–öz-özlüyündə nəcis olan şeylərə deyilir. (Qan və bovl kimi[۴۱] -۱

## YER

Məsələ:۴۷. Əgər ayağın və ya ayaqqabının altı yol gedərkən nəcis olsa yol getməklə, yaxud ayağı yerə sürtməklə pak olar. Bu şərtlə ki, nəcasətin eyni (özü) aradan getsin, :torpaq da gərək

;pak olsun ❊

;quru olsun ❊

.qum, daş, döşənmiş kərpic və s. kimi şeylərdən olsun ❊

Məsələ:۴۸. Əgər yol getməklə və ya ayağı yerə sürtməklə ayağın və ya ayaqqabının altındakı nəcasət aradan getsə, pak olar. Amma daha yaxşı olar ki, ən azı ۱۵ addım yol .gedilsin

## GÜNƏŞ

:Məsələ:۴۹. Günəş (sonradan deyiləcək şərtlər daxilində) bu şeyləri pak edər

;Yeri ❊

;Bina və onun içərisindəki qapı və pəncərə kimi şeyləri ❊

.Ağac və bitgiləri ❊

:Məsələ:۵۰. Günəş aşağıdakı şərtlərlə pakedicidir

;Nəcis şey o qədər yaş olsun ki, başqa bir şey ona toxunanda o da yaş olsun ❊

.Nəcis şey günəşin düşməsi ilə qurusun; Əgər rütubətli qalarsa, pak olmaz ❊

Nəcasətin eyni (zərrələri) o şeyin üstündə olmasın; əgər olarsa, günəşin onun üstünə ❊ ;düşməsindən qabaq, o zərrələr aradan qaldırılmış olsun

Günəş şüalarının qarşısını pərdə, bulud və s. kimi bir şey almasın; Amma, əgər çox ❊ .nazik olub günəşin şüalarının qabağını almazsa, eybi yoxdur

* Günəş təklikdə nəcis şeyi qurutmuş olsun; (Məsələn, küləyin köməyi ilə qurutmasın).

* Binanın nəcis hopmuş divar və ya yerin daxil və xaricini bir dəfəyə qurutsun; deməli, xaricini bu gün, daxilini isə sabah qurudarsa, təkcə xarici pak olur.

Məsələ:۵۱. Əgər yer və bunun kimi şeylər nəcis olsa, amma səh:۴۳

rütubətli olmasa, ora bir qədər su və ya onu rütubətli edə biləcək bir şey tökmək .lazımdır ki, günəş düşüb paklasın

## İSLAM

Məsələ:۵۲. Kafir nəcisdir. Əgər kəlmeyi-şəhadətini, yə'ni "Əşhədu ən la ilahə illəllah və əşhədu ənnə Muhəmmədən rəsulullah" desə müsəlman olar. İslamı qəbul etməklə .bütün bədəni pak olar

## NƏCASƏTİN EYNİNİN ARADAN QALDIRILMASI

Məsələ:۵۳. İki halda nəcasət aradan qaldırılmaqla nəcis şey pak olur və daha suya :çəkməyə ehtiyac yoxdur

a) Heyvanın bədəni; Məsələn, nəcis yeyən toyuğun dimdiyindən nəcasəti .təmizləyəndə pak olur

b) Bədənin daxili. (Ağızın, burunun, qulağın içi kimi.) Məsələn, əgər dişi fırça ilə sürtəndə onun dibindən qan gəlsə və ağız suyunda həll olub itsə, ağızın içi pak olar. Onu suya çəkmək lazım deyil. Amma əgər fırça qana dəysə, ehtiyat vacibə görə, hətta .ağızın içində olsa da, nəcisdir

## DƏSTƏMAZ

Namaz qılan şəxs gərək namazdan əvvəl dəstəmaz alsın, özünü bu böyük ibadəti .yerinə yetirmək üçün hazırlasın

Bə'zi hallarda isə gərək qusl etsin. Yə'ni, bütün bədənini yusun. Dəstəmaz ala və ya qusul edə bilmirsə, gərək onların yerinə təyəmmüm adlanan başqa əməli yerinə .yetrisin. Bu hissədə hər birinin hökmləri ilə tanış olacaqsınız

## ?DƏSTƏMAZI NECƏ ALAQ

Məsələ:۵۴. Dəstəmazda insan gərək əvvəlcə üzünü, sonra sağ qolunu, daha sonra sol qolunu yusun, sonra əlini yumaq nəticəsində ovucunda qalan rütubətlə başına məsh çəksin. (Yə'ni əlini onun üstünə çəksin), daha sonra isə sağ ayağa və axırda sol ayağa

## DƏSTƏMAZ ƏMƏLLƏRİNİN İZAHI

### YUMAQ

Məsələ:۵۵. Dəstəmazda insan gərək üzünü başın tük bitən yerindən çənənin axırına qədər yuxarıdan-aşağı istiqamətdə yusun. Üzün bu vacib miqdarının tamamilə yuyulmasını yəqin etmək üçün bir az onun ətrafını da yumaq lazımdır.

Məsələ:۵۶. Üzü yuyandan sonra gərək sağ əli və sonra sol əli dirsəkdən barmaqların axırına qədər yusun.

Məsələ:۵۷. Dirsəyin tamamilə yuyulmasını yəqin etmək üçün, gərək dirsəkdən bir qədər yuxarı da yuyulsun.

Məsələ:۵۸. Üzünü yumamışdan əvvəl əllərini biləyə qədər yuyan şəxs dəstəmaz vaxtı barmaqlarının ucuna qədər yumalıdır. Əgər yalnız biləyinə qədər yusa, onun dəstəmazı batildir.

### MƏSH

Məsələ:۵۹. Başın dörd hissəsindən biri (alının yuxarı hissəsi) məsh yeridir.

Məsələ:۶۰. Başın məshi o qədər olmalıdır ki, görənlər “o, məsh edir” desinlər.

Məsələ:۶۱. Ehtiyat müstəhəb odur ki, başa uzunluğu bir barmaq və eni üç bağlı barmaq qədər məsh çəkilsin.

Məsələ:۶۲. Başın məshinin onun dərisinə çəkilməsi lazım (ilzami) deyil; hətta başın qabağındakı tükə də çəkilsə səhihdir. Amma əgər başın qabağının tükü çox uzun olarsa və saçını darayanda üzünə tökülərsə və yaxud başın başqa yerinə çatarsa, gərək başın dərisinə və ya tüklərin dibinə məsh çəkilsin.

Məsələ:۶۳. Başa məsh çəkəndən sonra dəstəmaz suyunun əldə qalmış yaşlığı ilə ayağın üstünə–barmaqların birinin başından ayağın üstündəki çıxıntıya qədər - məsh çəkməlidir.

Məsələ:۶۴. Məshdə əli başa və ayağa çəkmək lazımdır; Əgər əli saxlayıb, başı və ayağı

hərəkət etdirsə, dəstəmaz batildir. Amma əli məsh üçün çəkəndə baş və ayaq azacıq hərəkət etsə eybi yoxdur.

Məsələ:۶۵. Əgər məsh üçün əldə rütubət qalmazsa onu dəstəmaz suyundan başqa su ilə islatmaq olmaz. Əksinə, başqa dəstəmaz üzvlərindən rütubət götürüb onunla məsh .etməlidir

.Məsələ:۶۶. Əlin yaşlığı başda və ayaqda iz qoyacaq miqdarda olmalıdır

Məsələ:۶۷. Məsh çəkilən yer (baş və ayaqların üstü) quru olmalıdır. Əgər yaş olsa onu qurutmaq lazımdır. Amma məsh yerinin rütubəti çox az olsa və məsh çəkiləndən sonra əlin rütubəti məsh yerində görünsə, belə ki, "təkcə əlin rütubətidir" deyilsə, eybi .yoxdur

Məsələ:۶۸. Əl ilə baş və ya əl ilə ayaq arasında gərək çadra və papaq, yaxud corab və ayaqqabı kimi şeylər, hərçənd çox zərif və nazik olsalar və rütubət dəriyə çatsa da .(belə, fasilə düşməməlidir (amma çarəsizlik halında eybi yoxdur

Məsələ:۶۹. Məsh çəkilən yer pak olmalıdır. Əgər nəcis olsa və məhs üçün onu suya .çəkmək mümkün olmasa, təyəmmüm edilməlidir

## DƏSTƏMAZIN ŞƏRTLƏRİ

Məsələ:۷۰. Əgər aşağıdakı şərtlər mövcud olarsa dəstəmaz səhih, əks halda, hətta .onlardan biri belə olmazsa, dəstəmaz batildir

;(ci şərt budur ki, dəstəmazın suyu pak olsun (nəcis olmasın-۱

;(ci şərt budur ki, dəstəmazın suyu mütləq olsun (müzaf olmasın-۲

;(cü şərt budur ki, dəstəmazın suyu mübah olsun (qəsbi olmasın-۳

cü şərt budur ki, dəstəmazın suyunun olduğu qab da (sonradan deyiləcək şərhə-۴ ;əsasən) mübah olsun

;ci şərt budur ki, dəstəmazın suyunun qabı qızıl və ya gümüş olmasın-۵

;cı şərt budur ki, dəstəmaz üzvləri pak olsun-۶

ci şərt budur ki, dəstəmazın üzvlərində suyun bədənə dəyməsinin qarşısını alan-۷

;Təalanın əmrini yerinə yetirmək üçün) riya etmədən dəstəmaz alsın

;cu şərt budur ki, dəstəmazı (əvvəldə qeyd olunan) ardıcıllıqla yerinə yetirsin-٩

;cu şərt budur ki, dəstəmazın əməlləri arasında zaman fasiləsi düşməsin-١٠

ci şərt budur ki, dəstəmazın işlərində başqasından kömək almasın, özü yerinə-١١ ;yetirsin

ci şərt budur ki, sudan istifadə olunmasının şəxs üçün heç bir maneəsi və zərəri-١٢ ;olmasın

.cü şərt budur ki, namaz və ya dəstəmaz üçün kifayət qədər vaxt olsun-١٣

## DƏTƏMAZIN ŞƏRTLƏRİNİN İZAHI

Məsələ:٧١. Nəcis və ya müzaf su ilə alınan dəstəmaz batildir. İstər suyun nəcis və ya .müzaf olmasını bilsin, istərsə də bilməsin və ya unutmuş olsun

Məsələ:٧٢. Dəstəmaz suyu mübah olmalıdır. Buna əsasən, aşağıdakı hallarda :dəstəmaz batildir

;(Sahibi razı olmayan su ilə alınan dəstəmaz (sahibinin narazılığı mə’lumdur ❈

;Sahibinin razı olub-olmaması mə’lum olmayan su ilə alınan dəstəmaz ❈

Hamı üçün deyil, müəyyən adamlar üçün vəqf edilən su ilə alınan dəstəmaz; ❈ (Məsələn, bə’zi mədrəsələrin hovuzunun suyu ancaq həmin mədrəsədə təhsil alanlar üçün vəqf edilir, yaxud bə’zi məscidlərdəki dəstəmazxanalar həmin məsciddə namaz (.qılanlar üçün vəqf edilir

Məsələ:٧٣. Böyük arxlarda, hətta əgər insan sahibinin razı olub-olmamasını bilməsə belə, dəstəmaz almağın eybi yoxdur. Amma əgər onun sahibi orada dəstəmaz almağı .qadağan etsə, ehtiyat vacib odur ki, o su ilə dəstəmaz alınmasın

Məsələ:٧٤. Əgər dəstəmaz suyu qəsbi qabda olsa və ondan başqa da su olmasa, .təyəmmüm etmək lazımdır. Əgər bir kəs o su ilə dəstəmaz alsa, dəstəmazı batildir

Məsələ:٧٥. Dəstəmaz ə’zaları (yə’ni üz, əllər, ayaqlar) dəstəmaz üçün yuyanda və .məsh edəndə pak olmalıdır

Məsələ:٧۶. Əgər üzə və ələ dəstəmaz suyunun çatmasına mane olan bir şey yapışsa .dəstəmazdan əvvəl onu təmizləmək lazımdır

Məsələ:٧٧. Əgər məsh əzasının (baş və ayaqların) üstündə bir şey olsa, hərçənd suyun başa və ayağa çatmasının qarşısını almasa belə, onu təmizləmək lazımdır. Çünki əl ilə .məsh çəkilən yer arasında maneə olmamalıdır

Məsələ:٧٨. Mürəkkəb, rəng və yağ-piy ləkələri, krem (əgər rəngin maddəsi olmazsa) dəstəmaza mane olmur. Əgər maddəsi olarsa və dərinin üstünü tutmuş olarsa, onu .təmizləmək lazımdır

Məsələ:٧٩. Əgər bir şeyin dəstəmaz üzvlərinə yapışmasını bilsə, lakin o şeyin suyun dəriyə dəyməsinin qarşısını alıb-almadığını bilməsə, gərək onu aradan qaldırsın, yaxud .suyu onun altına çatdırsın

Məsələ:٨٠. Dəstəmazın işləri bu ardıcıllıqla yerinə yetirilməlidir: əvvəlcə üz, sonra sağ əl, daha sonra sol əl yuyulmalıdır. Ondan sonra başa və daha sonra ayaqlara məsh çəkilməlidir. Ehtiyat vacibə görə sağ ayağa sol ayaqdan əvvəl məsh çəkilməlidir. Əgər .bu tərtiblə dəstəmaz alınmazsa, batildir

Məsələ:٨١. Muvalat dedikdə dəstəmazın işlərini bir-birinin ardınca yerinə yetirmək, .onların arasında fasilə salmamaq nəzərdə tutulur

Məsələ:٨٢. Əgər insan dəstəmaz işləri arasında çox fasilə salsa, belə ki, bir yeri yumaq, ya məsh etmək istədikdə, ondan əvvəl yuduğu, yaxud məsh çəkdiyi yerlərin yaşlığı .qurumuş olsa, dəstəmaz batildir

Məsələ:٨٣. Özü dəstəmazın əməllərini yerinə yetirə bilən adam başqasından kömək ala bilməz. Deməli əgər başqası onun əlini, üzünü yusa və ya ayağına məsh çəksə, .dəstəmazı batildir

Məsələ:٨۴. Dəstəmaz ala bilməyən şəxs gərək başqasının köməyi ilə dəstəmaz alsın.

Amma özü və onun dəstəmazına kömək edən şəxs–hər ikisi dəstəmaz niyyəti .etməlidirlər

Məsələ:۸۵. Dəstəmaz alacağı təqdirdə xəstələnəcəyindən

qorxan şəxs vacib ehtiyata əsasən dəstəmaz almamalı, namaz üçün təyəmmüm etməlidir. Amma əgər suyun ona zərərli olmasını bilməyib dəstəmaz alsa və sonra zərərli olduğunu başa düşsə, dəstəmazı səhihdir. Amma müstəhəb ehtiyat budur ki, o .dəstəmazla namaz qılmasın

Məsələ:۸۶. Dəstəmaz gərək qürbət qəsdi ilə, yə’ni Allahın fərmanını yerinə yetirmək üçün alınsın. Dəstəmazda niyyəti dil ilə demək, yaxud qəlbdən keçirtmək lazım (ilzami) deyil. Əksinə, dəstəmaz almasını bilirsə, elə bu kifayətdir. Belə ki, ondan “nə edirsən?” .deyə soruşsalar, “dəstəmaz alıram” desin

Məsələ:۸۷. Hərgah vaxt çox az olsa və dəstəmaz alınacağı təqdirdə namazın hamısı və ya bir qədəri namaz vaxtından sonraya (qəzaya) düşsə, gərək təyəmmüm etsin. Amma əgər dəstəmaz və təyəmmümün hər biri üçün eyni miqdarda vaxt olarsa, .gərək dəstəmaz alsın

## CƏBİRƏ DƏSTƏMAZI

Yaranın, sınıqlığın üzərinə qoyulan dərmanlar, onların bağlandığı parça və s. “cəbirə’ .adlanır

Məsələ:۸۸. Əgər bir kəsin dəstəmaz ə’zalarının birində yara, yaxud sınıqlıq olsa, bu halda o, adi qaydada dəstəmaz ala bilərsə, elə də almalıdır. Məsələn, yaranın üstü açıq olsa və suyun ona zərəri olmasa; yaxud yaranın üstünün bağlı olmasına baxmayaraq onu açmaq mümkün olsa, suyun da ona zərəri olmasa, onda adi qaydada dəstəmaz .almalıdır

Məsələ:۸۹. Əgər yara üzdə və ya əllərdə olsa və üstünü açmaq mümkün olsa, habelə suyu onun üstünə tökməyin zərəri olsa, bu halda onun ətrafı yuyulmalı, yaş əli çəkməyin zərəri olmasa, ehtiyat budur ki, yaş əllə onun üstünə çəkilsin, sonra pak bir .parçanı onun üzərinə qoyub yaş əllə o parçanın da üzərinə çəkilsin

Məsələ:۹۰. Cəbirə dəstəmazı alanda, yumaq və məsh çəkmək mümkün olan yerləri adi qaydada yumaq və məsh çəkmək, mümkün olmayan yerlərdə isə yaş əllə cəbirəyə .çəkmək lazımdır

ayaqların üzərində (məsh yerlərində) olsa və onun üstü açıq olsa, bu halda məsh çəkə bilməsə, gərək pak bir parçanı onun üstünə qoyub əldə qalmış dəstəmaz suyunun .yaşlığı ilə parçanın üstünə məsh çəksin

Məsələ:۹۲. Əgər üzdə və əllərdə bir neçə cəbirə olsa, onların arası yuyulmalıdır. Əgər cəbirələr başda və ya ayaqların üstündə olsa onların arası məsh edilməli, cəbirə olan .yerlərdə isə cəbirə göstərişlərinə uyğun əməl olunmalıdır

Məsələ:۹۳. Əgər bir kəsin əlinin içində və barmaqlarında cəbirə olsa, dəstəmaz alan zaman yaş əllə onun üstünə çəkibsə, başına və ayaqlarına da həmin rütubətlə məsh .çəkə bilər, həm də başqa dəstəmaz üzvlərindən rütubət götürə bilər

Məsələ:۹۴. Əgər cəbirə üzün, yaxud əllərdən birinin hər yerini örtmüş olsa, yenə də .cəbirənin hökmləri tətbiq olunacaq və cəbirə dəstəmazı kifayətdir

Məsələ:۹۵. Əgər cəbirə ayağın üstünün hamısını örtsə, amma bir az barmaqların tərəfindən, bir az da ayağın yuxarı tərəfindən açıq qalsa, açıq olan yerlərin özünə, .cəbirə olan yerlərdə isə cəbirənin üstünə məsh etməlidir

Məsələ:۹۶. Əgər cəbirə, yaranın ətrafını adi qaydadan artıq tutsa və onu götürmək mümkün olmasa, bu halda cəbirə göstərişlərinə əməl etməli, ehtiyat vacibə əsasən .təyəmmüm də almalıdır. Əgər cəbirəni götürmək mümkün olsa, götürməlidir

Məsələ:۹۷. Əgər dəstəmaz və qusul yerlərinə qoparılması mümkün olmayan, yaxud qoparıldıqda dözülməsi mümkün olmayan qədər əziyyəti olan bir şey yapışıbsa, .cəbirəyə əməl olunmalıdır

Məsələ:۹۸. Əgər cəbirə nəcis olsa və ya onun üstünə yaş əllə çəkmək mümkün olmasa (məsələn, yaranın üstündə ələ yapışan dərman olarsa), onda yaranın üstünə pak bir .parça qoyub yaş əllə parçanın üstündən çəkmək lazımdır

Məsələ:۹۹. Cəbirə quslu eynilə cəbirə dəstəmazı kimidir. Amma ehtiyat-vacibə əsasən .onu irtimasi deyil, tərtiblə yerinə yetirmək lazımdır

## DƏSTƏMAZ ALINMASI VACİB OLAN İŞLƏR

Məsələ:١٠٠. Meyyit namazından başqa sair namazlar, Kə'bə Evinin təvafı və bədəninin hər hansı yerini Qur'anın yazılarına və ya Allahın adlarına vurmaq üçün dəstəmaz .alınmalıdır

.Məsələ:١٠١. Əgər namaz və ya təvaf dəstəmazsız yerinə yetirilərsə, batildir

Məsələ:١٠٢. Dəstəmazı olmayan şəxs bədəninin hər hansı yerini Qur'anın yazılarına .vurmamalıdır. Amma onun tərcüməsinə vurmağın eybi yoxdur

Məsələ:١٠٣. Dəstəmazı olmayan şəxs, yaxşı olar ki, bədəninin hər hansı yerini Allahın .başqa dillərdə olan adına (Xuda, Tanrı və s.) da vurmasın

:Məsələ:١٠٤. Aşağıdakı işlər üçün dəstəmaz almaq müstəhəbdir

;Məscidə və İmamlar (əleyhimüs-salam)-ın hərəminə getmək üçün ❊

;Qur'an oxumaq üçün ❊

;Qur'anı özü ilə aparmaq üçün ❊

;Qur'anın cildinə və haşiyələrinə məss etmək (əl sürtmək) üçün ❊

.Qəbiristan əhlinin ziyarət etmək üçün ❊

## QUSUL

Bə'zən namaz, habelə dəstəmazla yerinə yetirilməli olan sair işlər üçün qusul vacib .olur

## QUSUL ETMƏYİN QAYDASI

Məsələ:١٠۶. Qusulda baş və boyun və sinə də daxil olmaqla bədənin hər yeri yuyulmalıdır. İstər qusul vacib olsun (məsələn, cənabət quslu kimi), istərsə də müstəhəb (məsələn, cümə quslu kimi). Başqa sözlə, bütün qusullar bir-biri ilə yalnız .niyyətdə fərqlənir

.Məsələ:۱۰۷. Qusulu iki cür etmək olar: tərtibi və irtimasi

Tərtibi qusulda əvvəlcə baş və boyun, sonra bədənin sağ

.tərəfi, daha sonra sol tərəfi yuyulmalıdır

## QUSLUN SƏHİH OLMASI ŞƏRTLƏRİ

Məsələ:۱۰۸. Muvalat istisna olmaqla, dəstəmazın səhih olması üçün lazım olan şərtlərin hamısı quslun da səhih olmasında şərtdir. Amma qusulda bədənin (dəstəmazdakı kimi) .yuxarıdan aşağı yuyulması ilzami deyil

Məsələ:۱۰۹. Boynunda bir neçə vacibi qusul olan bir kəs onların hamısını niyyət edərək ,bir qusul ala bilər

Məsələ:۱۱۰. Cənabət quslu alan bir kəs namaz üçün dəstəmaz almamalıdır. Amma .başqa qusullar ilə namaz qılmaq olmaz və dəstəmaz da almaq lazımdır

Məsələ:۱۱۱. İrtimasi qusulda bədənin hər yeri pak olmalıdır. Amma tərtibi qusulda bədənin hamısının pak olması vacib deyil. Buna əsasən, əgər hər hissəsini qusul .etməmişdən qabaq suya çəksə, kifayətdir

.Məsələ:۱۱۲. Cəbirə quslu eynilə cəbirə dəstəmazı kimidir

Məsələ:۱۱۳. Vacibi oruc tutan bir kəs irtimasi qusul edə bilməz. Çünki, oruc tutan şəxs başının hər yerini suyun altına sala bilməz. Amma əgər unutqanlıq üzündən irtimasi .qusul etsə səhihdir

Məsələ:۱۱۴. Qusulda bədənin hər yerinin əllə yuyulması vacib deyil; əgər qusul niyyəti .ilə suyu bədəninin hər yerinə çatdırsa, kifayətdir

## VACİBİ QUSULLAR

Məsələ:۱۱۵. Vacibi qusullar yeddidir: ۱-Cənabət quslu; ۲-Heyz quslu; ۳-Nifas quslu; ۴-İstihazə quslu; ۵-Meyyit quslu; ۶-Məss-meyyit quslu; ۷-Nəzir, and içmə s. səbəbilə .vacib olan qusullar

## CƏNABƏTİN HÖKMLƏRİ

Məsələ:۱۱۶. Əgər insandan, hətta yuxuda belə məni(۱)xaric olsa, yaxud cinsi əlaqədə olsa, cünub olur. Belə olan halda namaz və təharət lazım olan sair işlər üçün cənabət .quslu etməlidir

Məsələ:۱۱۷. Əgər məni öz yerindən hərəkət etsə, amma xaric olmasa, cənabətə səbəb .olmaz

Məsələ:۱۱۸. Əgər bir kəs məninin ondan xaric olmasını; yaxud ondan xaric olan şeyin .məni olduğunu bilsə, bu halda gərək qusul etsin

Məsələ:۱۱۹. Əgər insandan bir rütubət xaric olsa və onun bovl, məni və ya başqa şey olmasını bilməsə, bu halda əgər şəhvətlə və sıçrayışla çölə gəlsə və gələndən sonra bədən süstləşsə, o yaşlıq mənidir. Əgər onda bu əlamətlərdən heç biri, yaxud bə’zisi olmasa, məni hökmündə deyil. Amma qadında və xəstədə bir əlamətin olması, yə’ni .şəhvətlə xaric olması kifayətdir

Məsələ:۱۲۰. Müstəhəbdir ki, insan, məni gələndən sonra bovl etsin. Əgər bovl etməsə və qusuldan sonra məni və ya başqa bir şey olmasını bilmədiyi bir rütubət görsə, məni .(hökmündədir (yə’ni təzədən qusul etməlidir

## CÜNUBA HARAM OLAN ŞEYLƏR

Məsələ:۱۲۱. İnsan cünub olduğu vaxtdan qusul edəcəyi və ya qusul etməyə qadir :olmadığı halda təyəmmüm edəcəyi vaxta qədər aşağıdakı işlər ona haramdır

Bədənin hər hansı yerini Qur’anın yazısına və Allahın mübarək adına vurmaq;-۱ habelə, ehtiyat vacibə görə peyğəmbərlərin və imamlar (əleyhimüs-salam)-ın adlarına .da vurmaq bu hökmdədir



---

Məni–cinsiyyət üzvindən (bovl kanalı ilə) cinsi əlaqə, yaxud yuxuda ikən xaric[۴۲] -۱ .olan maye–spermadır

Məscidül-Hərama və Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) məscidinə-۲
.getmək; hətta əgər bir qapısından daxil olub digərindən çıxmaq kimi olsa da

Başqa məscidlərdə dayanmaq; amma bir qapısından daxil olub, başqa qapısından-۳
çıxsa, yaxud hər hansı bir şeyi götürmək üçün məscidə daxil olsa eybi yoxdur. Ehtiyat-
.vacib budur ki, İmamlar (əleyhimüs-salam)-ın hərəmində də dayanmasın

;Məscidə bir şey qoymaq-۴

Vacibi səcdəsi olan surələri, hətta onların bir hərfini belə oxumaq. O surələr-۵
:aşağıdakılardan ibarətdir

;a) "Səcdə' Surəsi

;b) "Fussilət" Surəsi

;v) "Nəcm" Surəsi

.q) "Ələq" Surəsi

Məsələ:۱۲۲. Əgər bir şəxs öz evində müəyyən bir yeri namaz üçün ayırsa, ora məscid
(.hökmündə deyil. (Həmçinin müəssisə və idarələrdəki namaz yerləri də bu qəbildəndir

Məsələ:۱۲۳. Cünub şəxsin imamzadələrin hərəmində cənabətli halda qalmasının eybi
.yoxdur, amma adətən hərəmin kənarında tikilən məsciddə dayanmaq haramdır

**MEYYİT QUSLU**

Məsələ:۱۲۴. Əgər bir müsəlman dünyadan getsə, qusul verilib kəfənə bükülməli və
(namaz qılındıqdan sonra dəfn edilməlidir.(۱

**MƏSS–MEYYİT QUSLU**

Məsələ:۱۲۵. Əgər insan öz bədəninin hər hansı yerini bədəni soyumuş və hələ qusul
.verilməmiş meyyitə vursa, məss-meyyit quslu etməlidir

۱- [۴۳]Meyyitin hökmləri ilə ətraflı tanış olmaq üçün “Tovzihul-məsail” risaləsinin ۵۴۲-ci məsələsinə baxın.

## QADINLARA VƏ QIZLARA MƏXSUS OLAN QUSULLAR

Məsələ:۱۲۶. Vacib qusullardan üçü–heyz, istihazə və nifas yalnız qızlar və qadınlar üçün vacibdir. Bu vacib qusulların səbəbi uşaqlıqdan (bətndən) xaric olan qandır. Hər birinin .özünə məxsus hökmləri vardır

## HEYZ (AYBAŞI) QUSLU

Məsələ:۱۲۷. Qadının heyz qanı dayandıqdan sonra, namaz, habelə dəstəmaz, qusul, .yaxud təyəmmümlə yerinə yetirilməli olan sair ibadətlər üçün qusul almalıdır

Məsələ:۱۲۸. Heyz qanı qız uşağı həddi-büluğa çatmamışdan (doqquz yaşı tamam olmamışdan) əvvəl gəlmir. Əgər bir qız həddi-büluğa çatmamışdan əvvəl qan görsə, .heyz hökmündə deyildir

Məsələ:۱۲۹. Heyzin müddəti üç gündən az olmaz. Deməli, əgər qan üç gündən əvvəl .dayanarsa, o qan heyz deyildir

Məsələ:۱۳۰. Heyzin müddəti on gündən çox olmur. Əgər on gündən çox olsa, on .gündən sonra gələn qanlar heyz hökmündə deyildir

Məsələ:۱۳۱. Heyz qanı əksər vaxtlarda qatı, isti, tünd rənglidir. Təzyiq ilə və bir qədər .yandırıcılıqla xaric olur

:Məsələ:۱۳۲. Heyz halında olan qadına bir neçə şey haramdır

;Namaz qılmaq və Kə’bə Evinin təvafı-۱

((Cünub şəxsə haram olan şeylər. (Məsciddə dayanmaq kimi.(۱-۲

Məsələ:۱۳۳. Qadına heyz halında namaz və oruc vacib deyil və bu müddətdə qılmadığı .namazların qəzası yoxdur. Amma orucların qəzasını tutmalıdır

.Məsələ:۱۳۴. Heyz quslu cənabət quslu kimidir. Fərq niyyətdədir

Məsələ:۱۳۵. Heyz quslu ilə namaz qılmaq olmaz, ondan əlavə, səh:۵۵

Bunlardan əlavə, bir neçə iş də haramdır ki, əlavə mə’lumat almaq üçün[۴۴] -۱
.“Tovzihul-məsail” risaləsinin ۴۵۱-ci məsələsinə baxa bilərsiniz

.dəstəmaz da almaq lazımdır

## İSTİHAZƏ QUSLU

Məsələ:۱۳۶. Qadınların və qızların bətnindən bə’zi vaxtlarda xaric olan qanlardan biri .də istihazə qanıdır

Məsələ:۱۳۷. İstihazə qanı adətən sarı rəngli, soyuq olur, təzyiq və yandırıcılıq olmadan çölə gəlir. Çox da qəliz deyil. Amma ola bilsin ki, bə’zi vaxtlar tünd, isti və qatı olsun, .təzyiqlə və yandırıcılıqla çölə gəlsin

Məsələ:۱۳۸. İstihazə qanı az və ya çox olmasına görə üç qismdir. Əgər az olsa, qusul alınmır, amma dəstəmazı batil edir. Əgər az olmasa, qusul da vacib olur. Onun qismləri ilə daha yaxşı tanış olmaq üçün qızlar “Tovzihul-məsail” risaləsində ۳۹۴-cü məsələyə .baxa bilərlər

## NİFAS QUSLU

Məsələ:۱۳۹. Nifs quslu uşaq doğuşuna aiddir və başqa vaxtlarda qadından nifas qanı görünmür. Doğuş zamanı baş verən qanaxmadan sonra bu quslu yerinə (.yetirməlidirlər. (“Tovzihul-məsail” risaləsinin ۵۰۷-ci məsələsində bəyan olunub

## TƏYƏMMÜM

Məsələ:۱۴۰. Aşağıdakı hallarda dəstəmaz və qusul əvəzində təyəmmüm almaq .lazımdır

;Dəstəmaz və qusul üçün su olmasa, yaxud su əldə edə bilməsə ⁕

Suyun zərəri olsa; Məsələn, sudan istifadə edəcəyi halda hər hansı bir xəstəlik ⁕ ;vücuda gələrsə, yaxud xəstəliyi şiddətlənərsə, və ya gec sağalarsa

Əgər insan suyu dəstəmaz və qusul üçün məsrəf edəcəyi halda özü, əyalı, övladları, ⁕ dostu və ona aid olan şəxslər susuzluqdan ölərsə, yaxud xəstələnərsə, yaxud da dözülməsi məşəqqətli olan qədər susayarlarsa (hətta heyvanlar da susuzluqdan tələf ;(olarsa

;qədərində suyu olsa, başqa paltarı da olmasa

Əgər vaxt çox az olsa və dəstəmaz, yaxud qusul alacağı təqdirdə namazın hamısı, ⁕ .(yaxud bir miqdarı namazın vaxtından sonra qılınacaqsa (qəza olacaqsa

## TƏYƏMMÜMÜN QAYDASI

:Məsələ:۱۴۱. Təyəmmümdə beş şey vacibdir

;Niyyət-۱

;İki əllərin içini təyəmmümün səhih olduğu şeyə vurmaq-۲

İki əli birlikdə alının hər yerinə və ətrafına, tüklər göyərən yerdən qaşlara və-۳ ;burunun yuxarı tərəfinə çəkmək

;Sol əlin içini sağ əlin tamamilə üstünə çəkmək-۴

.(Sağ əlin içini sol əlin tamamilə üstünə çəkmək (barmaqların da üstünə çəkilməlidir-۵

Məsələ:۱۴۲. Əllərin üstünün hamısına məss etməsini yəqin etmək üçün bir az biləkdən .yuxarı da məss etməlidir, amma barmaqların arasına məss etmək lazım deyil

Məsələ:۱۴۳. İnsan təyəmmüm üçün əlindəki üzüyü çıxarmalı, alnında, yaxud əllərində .maneə olsa onu aradan qaldırmalıdır

Məsələ:۱۴۴. Təyəmmümün bütün işləri qürbət qəsdi ilə, yə'ni Allahın fərmanını yerinə yetirmək niyyəti ilə yerinə yetirilməlidir. Həmçinin, niyyət edən zaman təyəmmümün dəstəmaz və ya qusul əvəzindən almasını müəyyən etməlidir. Bu, elə təyəmmümün .niyyətidir

## TƏYƏMMÜMÜN SƏHİH OLDUĞU ŞEYLƏR

Məsələ:۱۴۵. Təyəmmüm torpağa, quma, kəsəyə, daşa, bişmiş palçığa (əgər pak .olsalar) səhihdir

## TƏYƏMMÜMÜN HÖKMLƏRİ

Məsələ:۱۴۶. Qusul əvəzinə edilən təyəmmüm ilə dəstəmaz əvəzinə edilən təyəmmüm .arasında heç bir fərq yoxdur

Məsələ:۱۴۷. Əgər bir kəs dəstəmaz əvəzinə təyəmmüm etsə və ondan dəstəmazı batil .edən şeylərdən biri baş versə təyəmmüm batil olar

Məsələ:۱۴۸. Əgər bir kəs qusul əvəzinə təyəmmüm etsə və quslu batil edən işlərdən biri qarşıya çıxsa, təyəmmüm batildir. Məsələn, əgər cənabət quslu əvəzinə .təyəmmüm etsə və yenidən cünub olsa, təyəmmümü batil olar

Məsələ:۱۴۹. Təyəmmüm o zaman səhihdir ki, insan dəstəmaz ala, yaxud qusul edə bilməsin. Deməli əgər üzürsüz olaraq təyəmmüm etsə, düz deyildir. Əgər üzrü olsa və üzrü aradan qalxsa (məsələn, əvvəlcə suyu olmasa və sonradan tapılsa), təyəmmüm .batil olur

Məsələ:۱۵۰. Əgər cənabət quslu əvəzində təyəmmüm etsə, namaz üçün dəstəmaz alması lazım deyil. Amma əgər sair qusulların əvəzində təyəmmüm etsə, onunla namaz qıla bilməz və dəstəmaz almalıdır. Dəstəmaz da ala bilməsə, onun əvəzində .başqa bir təyəmmüm də almalıdır

## NAMAZ

Namaz dinin ən mühüm əməllərindəndir ki, əgər Allah-Təalanın dərgahında qəbul olsa, sair ibadətlər də qəbul olar; yox əgər qəbul olunmazsa sair əməllər də qəbul .olunmaz

Necə ki, insan gündə beş dəfə çayda çimsə, bədəni çirkdən təmizləndiyi kimi beşlik .təşkil edən namazlar da insanı günahlardan təmizləyir

Daha yaxşı olar ki, insan namazı vaxtın əvvəlində qılsın. Hər kəs namazı alçaq və yüngül saysa, namaz qılmayanlar kimidir. Peyğəmbəri Əkrəm (səlləllahu əleyhi və alihi və sələm) buyurub: "Namaza əhəmiyyət verməyən və onu yüngül sayan kəs axirət ".əzabına layiqdir

Yaxşı olar ki, namazın savabını azaldan işləri görməsin. Məsələn, yuxulu halda namaza dayanmasın, namazda göylərə tərəf baxmasın. Əksinə, namazın savabını artıran əməlləri yerinə yetirsin: pak-pakizə paltarlar geysin, özünü ətirləsin, başını darayıb, .dişlərini yusun

## NAMAZIN NÖVLƏRİ

### İŞARƏ

Namaza aid olan məsələlər və onun hökmləri ilə tanış olmaq üçün əvvəldə xatırlatmaq lazımdır ki, namaz ya vacibdir, ya da müstəhəb. Vacibi namazlar da iki qismdir. Onlardan bə'ziləri gündəlik vəzifədir ki, gün ərzində məxsus vaxtlarda qılınmalıdır. Digər qismi isə bə'zi vaxtlarda müəyyən səbəblərə görə vacib olur və gündəlik vəzifə .deyildir

### GÜNDƏLİK NAMAZLARIN VAXTI

Məsələ:۱۵۱. Gündəlik vacib namazlar beşdir və onların məcmusu ۱۷ rəkətdir: sübh (iki .(rəkət), zöhr və əsr (hər biri dörd rəkət), məğrib (üç rəkət), işa (dörd rəkət

Məsələ:۱۵۲. Zöhr və əsr namazının vaxtı, şər'i zöhrdən məğrib vaxtına qədərdir. Bu vaxtın əvvəlindən dörd rəkətlik namaz qılmaq vaxtı zöhr namazının məxsus vaxtıdır və məğribə də elə o qədər vaxt qalanda, əsr namazının məxsus vaxtıdır. Məğrib və işa namazının vaxtı gün batandan gecə yarısına qədərdir. Məğribdən üç rəkətlik namaz qılmaq qədər vaxt məğrib namazının məxsus vaxtı, gecə yarısına qədər dörd rəkətlik .namaz qədərində vaxt qalanda isə işa namazının məxsus vaxtıdır

### SÜBH AZANININ VAXTI

Məsələ:۱۵۳. Sübh namazının vaxtı sübh azanından gün çıxan vaxta qədərdir ki, bu vaxt ərzində qılınmalıdır. Sübh azanına nə qədər yaxın vaxtlarda qılınsa, bir o qədər yaxşıdır. Sübh azanına yaxın vaxtlarda günçıxan tərəfdən bir ağartı yuxarı tərəfə hərəkət edir ki, buna birinci fəcr deyilir. Bu ağlıq genişlənib yayılsa, buna ikinci fəcr .deyilir ki, sübh namazının əvvəl vaxtıdır

### ZÖHR

Məsələ:۱۵۴. Əgər çubuq və bu kimi şeyi şaquli vəziyyətdə yerə batırsalar, sübh günəş çıxanda onun kölgəsi günbatan tərəfə düşür. Günəş yuxarı qalxdıqca, onun kölgəsi azalır. Çubuğun kölgəsi azaldığı istiqamətdə ən az (minimum) nöqtəyə çatıb sonra

.(artmağa başladığı vaxt şər’i zöhr və zöhr namazının vaxtının əvvəlidir(١

### MƏĞRİB

Məsələ:١٥٥. Məğrib o vaxtdır ki, günün batmasından sonra məşriq tərəfində yaranan .qırmızılıq başın üstündən günbatana tərəf keçmiş olsun

### GECƏ YARISI

Məsələ:١٥۶. İşa namazının vaxtının axırı olan gecə yarısını hesablamaq üçün ehtiyat (vacib budur ki, gün batan vaxt ilə sübh azanı arasında olan vaxt ikiyə bölünsün.(٢

### NAMAZ VAXTININ HÖKMLƏRİ

Məsələ:١٥٧. Gündəlik namazlardan savayı o biri namazların xüsusi vaxtları yoxdur. Bu namazlar müəyyən bir zaman (məsələn, ayət namazı zəlzələ, ay və gün tutulmaları), ya da müəyyən bir hadisə (məsələn, meyyit namazı bir müsəlmanın vəfat etməsi) ilə .əlaqədar olaraq vacib olur

Məsələ:١٥٨. Əgər namazın hamısı vaxtından qabaq qılınsa, yaxud qəsdən öz vaxtından əvvəl qılmağa başlasa, batildir. (Əgər namaz öz vaxtında qılınsa, əhkam istilahında (.“namaz ədadır” və əgər vaxtı keçəndən sonra qılınsa “namaz qəzadır” deyirlər

Məsələ:١٥٩. İnsan gərək namazı, onun üçün müəyyən edilmiş vaxtda qılsın. Əgər .qəsdən o vaxtda qılmasa günahkardır

Məsələ:١۶٠. Müstəhəbdir ki, namaz əvvəl vaxtda qılınsın. Nə qədər əvvəl vaxta yaxın vaxtlarda qılınsa, bir o qədər yaxşıdır. 

---

Amma bə’zi şəhərlərdə (Məkkə kimi) bə’zi vaxtlar zöhr olanda çubuğun kölgəsi[۴٥] -١ tamamilə yox olur. Kölgə yenidən görünməyə başlayanda mə’lum olur ki, zöhr .olmuşdur

Təxminən zöhr azanından ١١ saat ١٥ dəqiqə keçəndən sonra məğrib və işa[۴۶] -٢ namazının axır vaxtı olur. Məsələn, Əgər zöhr azanı ١٢١٥-də olsa, gecə yarısı saat ١١٠٥-.də olacaqdır

Amma əgər tə’xirə salmaq müəyyən cəhətə görə yaxşı olsa (məsələn, gözləyib .namazı camaatla qılmaq istəsə), eybi yoxdur

Məsələ:۱۶۱. Əgər namazın vaxtı az olsa və onun bə’zi müstəhəb işlərini yerinə yetirdikdə namazın bir hissəsi öz vaxtından sonra qılınmış olacaqsa, gərək o müstəhəbbi işləri yerinə yetirməsin. Məsələn, əgər qunut tutacağı təqdirdə namazın .vaxtı keçəcəksə, gərək qunut tutmasın

Məsələ:۱۶۲. İnsan əsr namazını zöhrdən, işa namazını isə məğribdən sonra qılmalıdır. .Əgər qəsdən əsr namazını zöhrdən, işa namazını məğribdən əvvəl qılsa, batildir

## QİBLƏ

Məsələ:۱۶۳. Əzəmətli Məkkə şəhərində, Məscidül-Həramda yerləşən Kə’bə Evi qiblədir. .Namaz qılan onunla üzbəüz durmalıdır

Məsələ:۱۶۴. Məkkədən kənarda, oradan uzaqda olan şəxs üzü qibləyə dursa, belə ki, .“üzü qibləyə durub”, desələr kifayətdir

## NAMAZDA BƏDƏNİN ÖRTÜLMƏSİ

Məsələ:۱۶۵. Kişilər və oğlanlar namazda ovrətlərini örtməlidir. Daha yaxşı olar ki, .göbəkdən dizlərə qədər də örtsün

Məsələ:۱۶۶. Qadınlar və qızlar namazda bütün bədənini örtməlidirlər. Amma üzünü, dəstəmazda yuyulan miqdarda, əllərini biləyə qədər, ayaqlarını topuğa qədər ötrməsi .lazım (ilzami) deyil, onun örtülməməsinin eybi yoxdur

:Məsələ:۱۶۷. Namaz qılanın paltarında aşağıdakı şərtlər lazımdır

;(Pak olsun (nəcis olmasın ❈

;(Ehtiyat-vacibə görə mübah olsun (qəsbi olmasın ❈

Ölü heyvandan (məsələn, şəriət qanunlarına müvafiq kəsilməyən heyvandan) ❈ ;olmasın. Hətta papaq və qayış kimi şeyləri də

⁕ Əti haram olan heyvanlardan (pələng, tülkü və s.) olmasın;

⁕ Əgər namaz qılan kişidirsə, paltarı xalis ipəkdən və ya qızıldan toxunmuş olmasın.

səh:۶۱

.Məsələ:۱۶۸. Namaz qılanın paltarından əlavə, bədəni də pak olamalıdır

Məsələ:۱۶۹. Əgər insan paltar və bədəninin nəcis olmasını bilsə, amma namaz vaxtı unutsa və onunla namaz qılsa, namazı batildir

Məsələ:۱۷۰.Aşağıdakı hallarda namaz qılanın bədəni və ya paltarı nəcis olsa, onun :namazı səhihdir

;Bədən və ya paltarının nəcis olmasını bilməsə və namaz qılandan sonra başa düşsə ⁕

Bədəni və ya paltarı, bədənində olan yara səbəbilə nəcis olsa və onu suya çəkmək, ⁕ ;dəyişmək çətin olsa

(Namaz qılanın paltarı və ya bədəni dirhəm miqdarından az qana bulaşarsa;(۱ ⁕

Nəcis paltar və ya bədənlə namaz qılmağa naçar olsa (məsələn, suya çəkməyə suyu ⁕ .(olmasa

Məsələ:۱۷۱. Əgər namaz qılanın, ovrəti örtə bilməyən kiçik paltarları (corab, əlcək və s. kimi) nəcis olsa, yaxud nəcis dəsmal cibində olsa, bu halda əti haram və ya murdar .olmuş heyvandan hazırlanmış olmasa, onunla namaz qılmağın eybi yoxdur

Məsələ:۱۷۲. Namazda əba, ağ paltar və paltarların ən təmizini geymək, xoş iyli ətirdən .istifadə etmək, əqiq üzük taxmaq müstəhəbdir

Məsələ:۱۷۳. Namazda qara, çirkli, dar, üstündə şəkil olan paltar geymək; həmçinin .paltarın düymələrinin açıq olması məkruhdur

## NAMAZ QILANIN YERİ

:Məsələ:۱۷۴. İnsanın namaz qıldığı yerdə aşağıdakı şərtlər olmalıdır

;(Mübah olsun (qəsbi olmasın ⁕

Hərəkətsiz, qərarlaşan olsun (maşın kimi hərəkət halında səh:۶۲ ⁕

---

Bu məsələdə bir neçə istisna hal vardır ki, “Tovzihul-məsail” risaləsinin ۸۶۷-ci[۴۷] -۱

;(olmasın

Yeri dar, tavanı alçaq olan yerdə qılınmasın ki, onun qiyam, rüku, səcdəsini səhih ❊ .tərzdə yerinə yetirmək mümkün olsun

Əgər namaz qılanın yeri nəcis olsa, bədənə və ya paltara sirayət edəcək dərəcədə ❊ ;yaş olmasın

;Namaz qılanın (səcdədə) alnının qoyduğu yer nəcis olmasın ❊

Namaz qılanın alnının yeri ayaqlarının qoyduğu yerdən dörd bağlı barmaq qədər uca, ❊ (yaxud alçaq olmasın. Amma yerin alçaq-ucalığı çox az olsa, eybi yoxdur.(١)

## NAMAZ QILANIN YERİNİN HÖKMLƏRİ

Məsələ:١٧٥. Çarəsizlik halında hərəkət edən yerdə (qatar və təyyarə və s. kimi) və ya tavanı alçaq, yaxud dar (səngər kimi), habelə düz olmayan yerdə namaz qılmağın eybi yoxdur. Amma mümkün olan qədər hərəkət halında bir şey oxumamalıdır (qiblənin .(istiqaməti və muvalata riayət etməklə

Məsələ:١٧۶. İnsan gərək ədəb qaydalarına riayət edib Peyğəmbər (s)-in, imamlar (əleyhimüs-salam)-ın qəbrindən qabaqda namaz qılmasın (yə'ni arxası qəbrə tərəf .olmasın). Əgər belə namaz qılması ehtiramsızlıq olsa bu iş haram, namazı da batildir

Məsələ:١٧٧. Müstəhəbdir ki, insan vacib namazları məsciddə qılsın. Müqəddəs İslam .dinində namazın məsciddə qılınmasına dair çoxlu tövsiyə olunmuşdur

## MƏSCİDİN HÖKMLƏRİ

Məsələ:١٧٨. Qeyd olunacaq məsələlərdən məscidə getməyin və onda namaz qılmağın :əhəmiyyətini başa düşmək olar

.Məscidə çox getmək müstəhəbdir ❊

.Namaz qılanı olmayan məscidə getmək müstəhəbdir ❊

Məscidin qonşuluğunda olan bir kəsin üzrü olmadan ❊

.məsciddən başqa yerlərdə namaz qılması məkruhdur

Müstəhəbdir ki, insan məscidə getməyən bir kəslə çörək yeməsin, işlərində onunla ❈ .məşvərət etməsin, onunla qonşu olmasın, ona qız verib qız almasın

:Məsələ:۱۷۹. Məsciddə bu işlər haramdır

;Ehtiyat vacibə görə qızılla zinət vermək ❈

.Məscidi murdarlamaq; Hər kəs nəcis olduğunu bilsə, dərhal paklamalıdır ❈

;Məscidi satmaq–hətta xarab olsa da ❈

;İnsan və heyvanların şəklini çəkmək ❈

:Məsələ:۱۸۰. Məscidlə əlaqədar olan aşağıdakı işlər müstəhəbdir

;Məscidə hamıdan tez gedib, hamıdan gec çıxmaq ❈

;Məscidin işıqlarını yandırmaq ❈

Məscidə getmək istəyən bir kəs müstəhəbdir ki, özünü ətirləsin, pak-pakizə, ən yaxşı ❈ ;paltarını geyinsin

;Məscidə daxil olanda əvvəl sağ ayağını, çıxanda isə sol ayağını atsın ❈

Məscidə daxil olanda müstəhəbdir ki, məscidə ehtiram niyyəti ilə iki rəkət namaz ❈ .qılsın

:Məsələ:۱۸۱. Məscidlə əlaqədar aşağıdakı işlər məkruhdur

;(Məsciddə yatmaq (əgər çarəsizlik üzündən olsa, məkruh deyil ❈

;Məsciddə namaz qılmadan, sadəcə olaraq oranı keçid yeri kimi seçmək ❈

;Dünya işləri barəsində söhbət etmək ❈

;Ağızın, burunun suyunu məscidə atmaq ❈

* Səsi ucaltmaq, qışqırmaq; (Amma azan üçün səsi ucaltmağın maneəsi yoxdur).

* Məsciddə alver etmək;

* Sarımsaq, soğan və bu kimi şeylər yeyib, ağzından gələn qoxu ilə camaata əziyyət verən şəxsin məscidə getməsi.

səh:۶۴

## NAMAZ ÜÇÜN HAZIRLIQ

Dəstəmaz, qusul, təyəmmüm məsələlərini, namazın vaxtı, namaz qılanın məkan və .paltarına aid olan məsələləri öyrəndikdən sonra namaza hazırlaşırıq

Məsələ:۱۸۲. Namaz qılan şəxsə müstəhəbdir ki, gündəlik namazlardan qabaq əvvəlcə .azan, ondan sonra iqaməni desin və sonra namaza başlasın

### AZAN

Allahu əkbər”________________________ ۴ dəfə“

Əşhədu ən la ilahə illəllah”____________ ۲ dəfə“

Əşhədu ənnə Muhəmmədən Rəsulullah” ۲ dəfə“

Həyyə ələssəlat”______________________ ۲ dəfə“

Həyyə ələlfəlah”______________________ ۲ dəfə“

Həyyə əla xəyril əməl”________________ ۲ dəfə“

Allahu əkbər”_______________________ ۲ dəfə“

La ilahə illəllah”_____________________ ۲ dəfə“

### İQAMƏ

Allahu əkbər”________________________ ۲ dəfə“

Əşhədu ən la ilahə illəllah”___________ ۲ dəfə“

Əşhədu ənnə Muhəmmədən Rəsulullah” ۲ dəfə“

Həyyə ələssəlat”_____________________ ۲ dəfə“

Həyyə ələlfəlah”_____________________ ۲ dəfə“

Həyyə əla xəyril əməl”________________ ۲ dəfə“

Qəd qamətissəlat”____________________ ٢ dəfə“

Allahu əkbər”_________________________ ٢ dəfə“

La ilahə illəllah”______________________ ١ dəfə“

Məsələ:١٨٣. “Əşəhədu ənnə Əliyyən vəliyyullah” azan və iqamənin hissələrindən deyil. Amma yaxşı olar ki, “əşhədu ənnə Muhəmmədən Rəsulullah” dedikdən sonra qürbət .qəsdi ilə deyilsin

## AZAN VƏ İQAMƏNİN HÖKMLƏRİ

Məsələ:١٨۴. Azan və iqamə namaz vaxtı daxil olandan sonra deyilməlidir. Əgər namaz .vaxtından qabaq deyilsə, batildir

Məsələ:١٨۵. İqamə azandan sonra deyilməlidir; əgər ondan əvvəl deyilsə, səhih .deyildir

Məsələ:١٨۶. Azan və iqamənin cümlələri arasında çox fasilə salınmamalıdır. Əgər .onların arasında adi haldan çox fasilə düşsə gərək yenidən deyilsin

Məsələ:١٨٧. Əgər hər hansı camaat namazı üçün azan və iqamə deyilmiş olsa, o .camaatla birlikdə namaz qılan bir kəs öz namazı üçün azan və iqamə deməməlidir

Məsələ:١٨٨. Əgər insan namaz qılmaq üçün məscidə gedib orada təşkil olunan camaat namazının qurtardığını görsə, bu camaat namazı üçün azan və iqamə deyilmiş olsa, nə qədər ki, cərgələr pozulmayıb və camaat dağılışmayıb öz namazı üçün azan və iqamə .oxumaq lazım deyil

.Məsələ:١٨٩. Müstəhəb namazın azan və iqaməsi yoxdur

Məsələ:١٩٠. Müstəhəbdir ki, uşağın dünyaya gəldiyi ilk gündə sağ qulağına azanı, sol .qulağına isə iqaməni desinlər

Məsələ:١٩١. Müstəhəbdir ki, azan demək üçün müəyyən olunan şəxs adil, vaxt tanıyan, .səsi uca olsun

## NAMAZIN ƏMƏLLƏRİ

.Məsələ:١٩٢. Namaz “Allahu Əkbər” deməklə başlayır, salam deməklə qurtarır

.Məsələ:١٩٣. Namazın işləri ya vacibdir, ya da müstəhəbdir

Məsələ:١٩۴. Namazın vacibləri on birdir. Onların bə’ziləri rükn, bə’ziləri isə qeyri- .rükndür

## NAMAZIN VACİBATI

Rüku ❊

Səcdə ❊

Qiraət ❊

Zikr ❊

Təşəhhüd ❊

Salam ❊

Tərtib ❊

Muvalat ❊

**Namazın rüknləri**

Niyyət ❊

Təkbirətül-ehram ❊

Təkbirətül-ehram dediyi vaxt, həmçinin rükuya müttəsil olan (rükudan qabaqkı) ❊ ,(qiyam (yə’ni ayaq üstə durmaq

Rüku ❊

.İki səcdə ❊

## RÜKN İLƏ QEYRİ-RÜKNÜN FƏRQİ

Məsələ:١٩٥. Namazın rüknləri onun əsas hissələridir. Əgər insan onlardan birini yerinə yetirməsə, yaxud namazda artırsa, hətta unutqanlıq üzündən də olsa, namaz batil olur. Bə’zi vacibatlar isə rükn deyil. Onların yerinə yetirilməsinin lazım olmasına baxmayaraq, qəsdən yerinə yetirilməzsə, namaz batil olur. Amma səhvən, unutqanlıq .üzündən azaldılıb-artırılsa batil olmaz

## NAMAZIN VACİBATININ HÖKMLƏRİ

## NIYYƏT

Məsələ:۱۹۶. İnsan namazın əvvəlindən axırına qədər öz niyyətində sabit qalmalı, nə etdiyini bilməlidir. Onu Allah-Təalanın əmrini yerinə yetirmək niyyəti ilə qılmalıdır.

Məsələ:۱۹۷. Niyyətin dildə deyilməsi lazım (ilzami) deyil. Amma əgər dildə də desələr, eybi yoxdur.

Məsələ:۱۹۸. Namaz hər növ riya, özünü kiməsə göstərməkdən

uzaq olmalıdır, yə'ni yalnız Allahın əmrini yerinə yetirmək üçün qılınmalıdır. Deməli .namazın hamısı, yaxud bir hissəsi Allahdan qeyrisi üçün qılınsa, batildir

### TƏKBIRƏTÜL–EHRAM

Məsələ:۱۹۹. Qeyd olunduğu kimi namaz "Allahu Əkbər" deməklə başlayır və bu təkbir təkbirətul-ehram adlanır. (Çünki, bu təkbiri deməklə namazdan qabaq halal olan bir (.çox işlər (yemək, içmək, gülmək, ağlamaq və s.) namaz qılana haram olur

Məsələ:۲۰۰. Təkbirətül-ehramı, habelə namaz əsnasındakı sair təkbirləri deyəndə əlləri .qulaqların müqabilinə qədər qaldırmaq müstəhəbdir

### QIYAM

Məsələ:۲۰۱. Qiyam–yə'ni ayaq üstə durmaq. Namaz qılan təkbirətül-ehramı və qiraəti .qiyamda, bədənin aram olduğu halda yerinə yetirməlidir

Məsələ:۲۰۲. Əgər insan rükunu unutsa və qiraətdən sonra səcdəyə getsə, amma səcdəyə çatmazdan qabaq rüku etmədiyi yadına düşsə, ayağa qalxıb yenidən rüku .etməli, sonra səcdəyə getməlidir

Məsələ:۲۰۳. Namaz qılan şəxsin ayaq üstə olan vaxt hər iki ayağın yerdə olması vacibdir. Amma bədənin ağrılığının hər iki ayağın üstünə düşməsi lazım (ilzami) deyil, .hətta bir ayağın üstünə də düşsə eybi yoxdur

Məsələ:۲۰۴. Əgər bir kəs namaz əsnasında ümumiyyətlə hətta əsaya, divara söykənməklə də olsa, ayaq üstə dura bilməsə, oturub üzü qibləyə namaz qılmalıdır. .Otura da bilməsə, uzanıb namaz qılmalıdır

Məsələ:۲۰۵. Vacibdir ki, rükudan sonra kamil surətdə qalxıb sonra səcdəyə getsin. .Əgər bu qiyamı (durmağı) qəsdən tərk etsə namazı batildir

### QIRAƏT

Məsələ:۲۰۶. Gündəlik namazların birinci və ikinci rəkətində əvvəlcə “Həmd”, sonra isə .bir Surə (məsələn, “Tövhid” surəsi) bütöv oxunmalıdır

### HƏMD SURƏSI

.”Bismillahir-rəhmanir-rəhim“

.”Əlhəmdu lillahi Rəbbil-aləmin“

”Ər-rəhmanir-rəhim“

.”Maliki yovmiddin“

.”İyyakə nə’budu və iyyakə nəstəin“

”İhdinəs-siratəl müstəqim“

”Siratəl-ləzinə ən”əmtə ələyhim“

.”Ğəyril-məğzubi ələyhim vələzzallin“

### TÖVHID” SURƏSI“

”Bismillahir-rəhmanir-rəhim“

”Qul huvəllahu əhəd“

”Allahus-səməd“

”Ləm yəlid və ləm yuləd“

”Və ləm yəkun ləhu kufuvən əhəd“

Namazın üçüncü və dördüncü rəkətlərində, ya təkcə Həmd deyilməlidir, ya da üç dəfə .təsbihati-ərbəə. Ehtiyat vacib budur ki, təsbihati-ərbəə üç dəfə deyilsin

### TƏSBIHATI–ƏRBƏƏ

”.Subhanəllahi vəlhəmdu lillahi və la ilahə illəllahu vəllahu əkbər“

## QIRAƏTIN HÖKMLƏRI

Məsələ:۲۰۷. Namazın üçüncü və dördüncü rəkətlərində Həmd, yaxud təsbihati-ərbəə .alçaqdan, ahəstə oxunmalıdır

səh:۶۹

Məsələ:۲۰۸. Zöhr və əsr namazının ۱-ci və ۲-ci rəkətində də “Həmd” və “Surə’ ahəstə .oxunmalıdır

Məsələ:۲۰۹. Kişilər və oğlanlar sübh, məğrib, işa namazının (۱-ci və ۲-ci rəkətində) “Həmd” və “Surə’ni ucadan oxumalıdırlar. Amma qadınlar və qızlar naməhrəm şəxslər səslərini eşitməzsə, ucadan qıla bilərlər. Amma əgər naməhrəm onların səsini eşitsə, .ehtiyat-vacibə görə ahəstə qılmalıdırlar

Məsələ:۲۱۰. Əgər insan namazı ucadan qılmalı olduğu yerdə qəsdən alçaqdan və ya alçaqdan qılmalı olduğu yerdə qəsdən ucadan qılsa namazı batildir. Amma unutqanlıq, .yaxud məsələni bilməməzlik üzündən olsa, səhihdir

Məsələ:۲۱۱. Əgər “Həmd” və “Surə’ni oxuduğu vaxtda səhv etdiyini başa düşsə (məsələn, alçaqdan qılmalı olduğu yerdə ucadan qılsa), oxuduğu miqdarı yenidən .oxuması lazım deyil

Məsələ:۲۱۲. İnsan namazı öyrənməlidir ki, səhv oxumasın. Əgər bir kəs namazı düzgün şəkildə ümumiyyətlə öyrənə bilmirsə, necə bacarırsa, elə də qılmalıdır və ehtiyat-.müstəhəb budur ki, namazı camaatla qılsın

## RÜKU

Məsələ:۲۱۳. Namaz qılan hər rəkətdə qiraətdən sonra o qədər əyilməlidir ki, əllərini .dizinə qoya bilsin. Bu əmələ rüku deyilir. Rükuda zikr demək vacibdir

Məsələ:۲۱۴. İnsan rükuda hər zikri desə kifayətdir. Amma ehtiyat-vacib budur ki, üç dəfə “subhanəllah”, yaxud bir dəfə “subhanə Rəbbiyəl əzimi və bi həmdih”dən az .olmasın

.Məsələ:۲۱۵. Rükuda vacibi zikr deyildiyi vaxt, bədən aram olmalıdır

Məsələ:۲۱۶. Əgər rüku həddinə qədər əyilməzdən və bədən aram olmazdan qabaq .rükunun zikrini desə, namazı batildir

Məsələ:۲۱۷. Əgər vacibi zikr qurtarmazdan əvvəl qəsdən başını rükudan qaldırsa, .namazı batildir

.hər rəkətində rükudan sonra iki səcdə etməlidir

Məsələ:۲۱۹. Səcdə o əməldir ki, alın, əllərin içi, dizlərin gözü və iki ayağın baş .barmağının ucu yerə qoyulsun. Səcdə halında zikr demək vacibdir

Məsələ:۲۲۰. Səcdədə hər zikr deyilsə, kifayətdir. Bu şərtlə ki, onun miqdarı üç dəfə ."subhanəllah" və ya bir dəfə "subhanə Rəbbiyəl-ə'la və bi həmdih"dən az olmasın

.Məsələ:۲۲۱. Səcdənin zikri deyilən vaxt bədən aram olmalıdır

Məsələ:۲۲۲. Əgər alnı yerə çatmazdan və bədən aramlaşmamışdan qabaq qəsdən səcdənin zikrini desə, namazı batildir. Amma unutqanlıq üzündən olsa, yenidən, bədən .aram olan halda zikri deməlidir

Məsələ:۲۲۳. Birinci səcdənin zikri qurtarandan sonra qalxıb oturmaq, bədən aram .olduqdan sonra yenidən səcdəyə getmək lazımdır

Məsələ:۲۲۴. Əgər namaz qılan şəxs zikr tamam olmamışdan qabaq qəsdən başını .səcdədən götürsə, namazı batildir

Məsələ:۲۲۵. Səcdənin zikrini dediyi vaxt əgər yeddi səcdə üzvündən birini qəsdən yerdən qaldırsa, namazı batildir. Amma zikr demədiyi vaxt alından başqa sair üzvləri .yerdən qaldırıb yenidən yerə qoysa, eybi yoxdur

Məsələ:۲۲۶. Əgər namaz qılan ayağın baş barmaqları ilə yanaşı başqa barmaqlarını da .yerə qoysa, eybi yoxdur

Məsələ:۲۲۷. Namaz qılan şəxs səcdədə alnını yerə, yaxud yerdən göyərib geyilən və .yeyilən olmayan şeylərə (çubuq, ağac yarpağı və s.) qoymalıdır

Məsələ:۲۲۸. Mə'dəndən çıxarılan əşyalara–qızıla, gümüşə, əqiqə, firuzəyə və s. kimi .şeylərə səcdə etmək səhih deyil

Məsələ:۲۲۹. Yerdən göyərən və heyvanların yemi olan şeylərə (ot, saman kimi) səcdə .etmək səhihdir

Məsələ:۲۳۰. Əgər kağız, səcdənin səhih olduğu şeydən (Məsələn, saman, yaxud ağacdan) düzəlsə, ona səcdə etmək səhihdir. Habelə, pambıqdan hazırlanan kağıza .səcdə etməyin eybi yoxdur

-Məsələ:۲۳۱. Səcdə üçün hər şeydən yaxşı Həzrət Seyyidüş

Şühəda İmam Hüseynin (əleyis-salam) türbətidir. Ondan sonra adi torpaq, sonra daş .və daha sonra bitgilərdir

## ADİ QAYDADA SƏCDƏ EDƏ BİLMƏYƏN ŞƏXSLƏRİN VƏZİFƏLƏRİ

Məsələ:۲۳۲. Alnını yerə çatdıra bilməyən bir kəs bacardığı qədər əyilib möhürü uca bir şeyin üstünə qoymalı və səcdə etməlidir. Amma əllərin içini, dizlərini və ayaqların .barmaqlarını adi qaydada yerə qoymalıdır

Məsələ:۲۳۳. Səcdə üçün ümumiyyətlə əyilə bilməyən bir kəs yerə oturub başı ilə (səcdəyə) işarə etməlidir. Amma ehtiyat vacib budur ki, mümkün olarsa, möhürü .qaldırıb alnını ona qoysun

## QUR'ANIN VACİBİ SƏCDƏSİ

Məsələ:۲۳۴. Qur'anın dörd surəsində vacibi səcdə vardır. İnsan hər vaxt bu ayəni oxusa və ya başqası oxuyanda ona qulaq assa, dərhal səcdə etməlidir. Əgər qulaq .asmasa və səcdə ayəsi qulağına dəysə, ehtiyat-vacibə görə səcdə etməlidir

:Məsələ:۲۳۵. Səcdə ayəsi olan surələr aşağıdakılardan ibarətdir

;Nəcm" Surəsi" ⁕

;Ələq" Surəsi" ⁕

;Səcdə' Surəsi" ⁕

.Fussilət" Surəsi" ⁕

.Məsələ:۲۳۶. Əgər səcdə etməyi unudarsa, hər vaxt yadına düşsə, səcdə etməlidir

Məsələ:۲۳۷. Əgər səcdə ayəsini radio, televizor və ya maqnitofondan eşitsə, gərək .səcdə etsin

Məsələ:۲۳۸. Əgər səcdə ayəsinin insan səsini yayan gücləndiricidən eşitsə, səcdə .etməsi vacibdir

.Məsələ:۲۳۹. Bu səcdədə zikr demək vacib deyil, amma müstəhbdir

## TƏŞƏHHÜD

Məsələ:۲۴۰. Vacibi namazların ikinci və axırıncı rəkətində, ikinci səcdədən sonra oturub, :bədənin aram olduğu halda təşəhhüd oxumalıdır. Yə’ni deməlidir

Əşhədu ən la ilahə illəllah, vəhdəhu la şərikə ləh, və əşhədu ənnə Muhəmmədən“ .əbduhu və Rəsuluh. Allahummə səlli əla Muhəmmədin və Ali-Muhəmməd

## SALAM

Məsələ:۲۴۱. Namazın axırıncı rəkətində təşəhhüddən sonra oturduğu və bədənin aram :olduğu halda salamı deyib namazı qurtarmaq lazımdır. Yə’ni deyilməlidir

”Əssəlamu ələykə əyyuhən-Nəbiyyu və rəhmətullahi və bərəkatuh“

Əssəlamu ələykum və rəhmətullahi və bərəkatuh”, yaxud“

Əssəlamu ələyna və əla ibadillahis-salihin.” desin“

Məsələ:۲۴۲. Əgər “Əssəlamu ələyna və əla ibadillahis-salihin” desə, ehtiyat-vacib .budur ki, ondan sonra “Əssəlamu ələykum və rəhmətulahi və bərəkatuh”u da desin

## TƏRTİB

Məsələ:۲۴۳. Namaz gərək bu tərtiblə qılınsın: niyyət, təkbirətül-ehram, qiraət, rüku, səcdə və ikinci rəkətdə səcdələrdən sonra təşəhhüd və axırıncı rəkətdə təşəhhüddən .sonra salam

## MUVALAT

Məsələ:۲۴۴. Muvalat–yə’ni namazın hissələrini bir-birinin ardınca yerinə yetirməli, .aralarında fasilə salmamalıdır

Məsələ:۲۴۵. Əgər bir kəs namazın hissələri arasında bir qədər fasilə salsa və daha .“namaz qılır” deyilməsə, namazı batildir

Məsələ:۲۴۶. Rüku, səcdə və qunutu uzatmaq, böyük surələri oxumaq namazın .muvalatına xələl yetirmir

## QUNUT

Məsələ:۲۴۷. Müstəhəbdir ki, namazın ikinci rəkətində Həmd-Surədən sonra və rükudan qabaq qunut tutulsun. Yə’ni namaz qılan əllərini qaldırıb üzünün müqabilində tutsun, dua və ya zikr desin.

Məsələ:۲۴۸. Qunutda hər zikr, hətta bir dəfə “subhanəllah” deyilsə kifayətdir. Amma daha yaxşı olar ki, bu dua oxunsun:

“Rəbbəna atina fid-dünya həsənətən və fil-axirəti həsənətən və qina əzabənnar.”

## NAMAZIN TƏ’QİBATI

Tə’qibat–yə’ni namazın salamından sonra zikr etmək, dua və Qur’an oxumaq.

Məsələ:۲۴۹. Daha yaxşı olar ki, tə’qibatı üzü qibləyə durub oxusun.

Məsələ:۲۵۰. Tə’qibatın ərəbcə olması vacib deyil. Amma daha yaxşı olar ki, dua kitablarında tövsiyə olunanları oxusun.

Məsələ:۲۵۱. Namazdan sonra daha çox sifariş olunan tə’qibat Həzrəti Zəhra (salamullahi əleyha)-nın zikridir ki, bu tərtiblə deyilməlidir: ۳۴ dəfə “Allahu Əkbər”, ۳۳ dəfə “əlhəmdu lillah”, ۳۳ dəfə “subhanəllah”.

## NAMAZI BATİL EDƏN ŞEYLƏR

Məsələ:۲۵۲. Namaz qılan şəxs təkbirətül-ehramı deyərək namaza başlayandan qurtarana qədər bə’zi işlər ona haram olur. Əgər namaz halında onların birinə əməl etsə namazı batildir. O cümlədən:

⁕ Danışmaq;

⁕ Gülmək;

⁕ Ağlamaq;

⁕ Üzü, qiblədən başqa tərəfə döndərmək;

;Yemək və içmək ❊

;Namazın surətini (formasını) pozmaq ❊

.Namazın rükünlərini azaltmaq və ya çoxaltmaq ❊

(ci məsələdə qeyd olunan kimi.)(١-١٩٥)

## NAMAZI BATİL EDƏN ŞEYLƏRİN HÖKMLƏRİ

### DANIŞMAQ

Məsələ:٢٥٣. Əgər namaz qılan şəxs qəsdən mə’nası olan bir kəlmə desə (istər bir hərfli olsun, istərsə də çox hərfli olsun), onun vasitəsilə müəyyən mə’nanı çatdırmaq istəsə, .namazı batildir

Məsələ:٢٥٤. Əgər səhvən (məsələn, namaz halında olduğunu unudaraq) bir söz desə .namazı batil olmaz

.Məsələ:٢٥٥. Öskürmək, asqırmaq namazı batil etmir

Məsələ:٢٥٦. İnsan namaz halında gərək başqasına salam verməsin. Amma başqası ona salam versə, cavab verməsi vacibdir və elə cavab verməlidir ki, salam kəlməsi əvvəldə olsun. Məsələn, “səlamun əleykum”. Amma “əleykumus-salam” deməməlidir .((salam kəlməsini axıra salmamalıdır

### AĞLAMAQ VƏ GÜLMƏK

.Məsələ:٢٥٧. Əgər namaz qılan qəsdən ucadan gülsə namazı batildir

Məsələ:٢٥٨. Gülümsəmək (təbəssüm) namazı batil etmir. Namazda Allah qorxusundan .qeyri məqsədlə ağlamaq namazı batil edər

### ÜZÜ QİBLƏDƏN ÇEVİRMƏK

Məsələ:٢٥٩. Əgər namaz qılan qəsdən üzünü qiblədən bir qədər döndərsə, belə ki, “üzü .qibləyədir” deməsələr, namazı batildir

Məsələ:٢٦٠. Əgər qəsdən, yaxud səhvən arxasını qibləyə çevirsə, yaxud qiblədən sağa .və ya sola dönsə namazı batildir

### YEMƏK VƏ İÇMƏK

Namazı batil edən sair şeylərlə tanış olmaq üçün “Tovzihul-məsail” risaləsinə[۴۹] -۱
.baxa bilərsiniz

Məsələ:۲۶۱. Əgər namaz qılan bir şey yesə və ya içsə, belə ki, ona “namaz qılır” .deyilməsə, namazı batildir

Məsələ:۲۶۲. Əgər namaz qılan bir şey yesə və ya içsə, hətta namazın surəti pozulmasa .da ehtiyat vacibə görə namazı batildir

### NAMAZIN SURƏTİNİ POZMAQ

Məsələ:۲۶۳. Əgər namaz qılan şəxs, onun surətini pozan (əl çalmaq, havaya tullanmaq .və s. kimi) bir iş görsə, hətta unutqanlıq üzündən olsa da namazı batil olar

Məsələ:۲۶۴. Əgər namaz əsnasında, namaz halından xaric olana qədər sakit qalsa, .namaz batildir

Məsələ:۲۶۵. İxtiyar üzündən vacibi namazı pozmaq haramdır, amma çarəsizlik halında :caizdir. O cümlədən

;Can və malın hifz olunması üçün ⁕

.Cana və mala dəyən zərərin qarşısını almaq üçün ⁕

Məsələ:۲۶۶. Aşağıdakı şərtlərlə camaatın borcunu qaytarmaq üçün namazı kəsməyin :eybi yoxdur

;Namaz əsnasında borcunu verə bilməzsə ⁕

;Tələbkar (borc verən) öz borcunu ondan istəyərsə ⁕

.Namaz vaxtı az olmasa, yə’ni borcu verəndən sonra namazını vaxtında qıla bilərsə ⁕

Məsələ:۲۶۷. Amma çox əhəmiyyəti olmayan bir şeyi hifz etmək üçün namazı pozmaq .məkruhdur

:Məsələ:۲۶۸. Namazda məkruh olan şeylərdən bə’zisi

;(Üzü azacıq sağa və ya sola döndərmək (çünki çox döndərmək namazı batil edir-۱

;Gözləri yummaq-۲

۳- Əllərlə, barmaqlarla oynamaq;

۴- Ağızın suyunu yerə atmaq;

۵- Qur’anın, kitabın, üzüyün yazılarına baxmaq; həmçinin, Həmdi, surəni oxuyanda və ya zikrləri deyən vaxtda başqasının sözünü eşitmək üçün səsi alçaltmaq;

səh:۷۶ Və ümumiyyətlə, Allah dərgahında xüzu və xüşunu(۱) aradan

---

۱- [۵۰] Allahın əzəmətini dərk etmək nəticəsində insanda yaranan xovf.

.aparan hər hansı bir işlə məşğul olmaq

## AZAN VƏ İQAMƏNİN TƏRCÜMƏSİ

.Allahu əkbər” Allah hər şeydən və hamıdan böyükdür“ ❋

Əşhədu ənla ilahə illəllah” Şəhadət verirəm ki, Allahdan başqa heç bir mə’bud“ ❋
;yoxdur

Əşhədu ənnə Muhəmmədən Rəsulullah” Şəhadət verirəm ki, Həzrəti Mühəmməd“ ❋
;Allahın rəsulu, göndərdiyi peyğəmbərdir

!Həyyə ələssəlat” tələs namaza doğru“ ❋

!Həyyə ələl-fəlah” tələs nicat tapmağa doğru“ ❋

!Həyyə əla xəyril-əməl” tələs xeyir əmələ doğru“ ❋

.Qəd qamətissəlat” Namaz bərqərar oldu“ ❋

.Allahu əkbər” Allah hər şeydən və hamıdan böyükdür“ ❋

.La ilahə illəllah” Allahdan başqa heç bir mə’bud yoxdur“ ❋

## HƏMD” SURƏSININ TƏRCÜMƏSI“

بِسْمِ اللّهِ الرَّحْمنِ الرَّحِيمِ

.Bismillahir-rəhmanir-rəhim”–yə’ni mehriban və rəhm edən Allahın adı ilə“

اَلْحَمْدُ لِلّهِ رَبِّ الْعالَمِينَ

Əlhəmdu lillahi Rəbbil-aləmin”–yə’ni həmd və səna yalnız aləmlərin pərvərdigarı olan“
.Allaha məxsusdur

اَلرَّحْمنِ الرَّحِيمِ

.Ər-rəhmanir-rəhim”–yə’ni, o Allah ki, mehriban və rəhm edəndir“

مَالِكِ يَوْمِ الدّينِ

.Maliki yovmiddin”–yə’ni, o Allah Qiyamət gününün padşahı və ixtiyar sahibidir“

إيّاكَ نَعْبُدُ وَ إيّاكَ نَسْتَعِينُ

İyyakə nə’budu və iyyakə nəstəin”–yə’ni, yalnız Sənə ibadət edir və yalnız Səndən“
.kömək istəyirik

اِهْدِنَا الصِّراطَ الْمُسْتَقِيمَ

!İhdinəs-siratəl müstəqim”–yə’ni, bizi doğru yola hidayət et“

صِرَاطَ الَّذِينَ أَنْعَمْتَ عَلَيْهِمْ

Siratəl-ləzinə ən’əmtə ələyhim”–yə’ni, o kəslərin yoluna hidayət et ki, onlara ne’mət“
.vermisən

غَيْرِ الْمَغْضُوبِ عَلَيْهِمْ وَ لاَ الضّآلّينَ

Ğəyril-məğzubi ələyhim vələzzallin”–yə’ni, o kəslərin yoluna hidayət etmə ki, onlara“
.qəzəb etmisən; və onların yoluna yox ki, yollarından azıblar

**:TÖVHID” SURƏSININ TƏRCÜMƏSI“**

بِسْمِ اللّهِ الرَّحْمنِ الرَّحيمِ

.Bismillahir rəhmanir rəhim” mehriban və rəhm edən Allahın adı ilə“

قُل هُوَ اللّهُ اَحَدٌ

.Qul huvəllahu əhəd” (Ey Peyğəmbər,) de ki: Allah yeganə olan Allahdır“

اَللّهُ الصَّمَدُ

.Allahus-səməd” O Allah ki, bütün mövcudatdan ehtiyacsızdır“

لَمْ يَلِدْ وَ لَمْ يُولَدْ

.Ləm yəlid və ləm yuləd” Övladı yoxdur və heç kəsin də övladı deyil“

وَ لَمْ يَكُنْ لَهُ كُفُواً اَحَدٌ

.Və ləm yəkun ləhu kufuvən əhəd” Heç kəs Onun misli, tayı-bərabəri deyil“

**:RÜKUNUN ZIKRI**

سُبحان رَبِّیَ العَظیمِ وَ بِحَمدِهِ

Subhanə Rəbbiyəl-əzimi və bihəmdih” Mənim böyük Pərvərdigarımı hər eyb və“ .nöqsandan pak və münəzzəh bilib Ona həmd-sitayiş edirəm

**SƏCDƏNIN ZIKRI**

سُبحان رَبِّیَ الاَعلی وَ بِحَمدِهِ

Subhanə Rəbbiyəl-ə’la və bihəmdih”–yə’ni, mənim hamıdan uca məqamlı“ Pərvərdigarımı hər eyb və nöqsandan pak və münəzzəh bilib Ona həmd-sitayiş .edirəm

**TƏSBIHATI–ƏRBƏƏNIN TƏRCÜMƏSI**

سُبحَانَ اللهِ وَالحَمْدُ للهِ وَلا اِلَهَ اِلاَّ اللهُ وَاللهُ اَکْبَر

Subhanəllahi vəlhəmdu lillahi və la ilahə illəllahu vəllahu əkbər” Hər eyb və nöqsandan“ pak və münəzzəhdir Allah, həmd, tə’rif yalnız Allaha məxsusdur, Allahdan başqa heç .bir mə’bud yoxdur. Allah hamıdan böyükdür

**TƏŞƏHHÜD VƏ SALAMIN TƏRCÜMƏSI**

اَلحَمدُ للهِ اَشْهَدُ اَن لا اِلَهَ الاَّ اللهُ وَحدَهُ لاشَرِیکَ لَهُ

Əlhəmdu lillah, əşhədu ənla ilahə illəllahu vəhdəhu la şərikə ləh” Sitayiş və həmd“ (tə’rif) Allaha məxsusdur. Şəhadət verirəm ki, Allahdan başqa heç bir, mə’bud .pərəstişə layiq şəxs yoxdur. Təkdir, şəriki yoxdur

وَاَشهَدُ اَنَّ مُحَمَّداً عَبْدُهُ وَرَسُولُهُ

Və əşhədu ənnə Muhəmmədən əbduhu və Rəsuluh”–Şəhadət verirəm ki, Mühəmməd“ .(səlləllahu əleyhi və alihi və səlləm) Allahın bəndəsi və Onun Rəsulu, göndərdiyidir

.Allah! Rəhmət göndər həzrət Mühəmmədə və Onun Əhli-beytinə

اَلسَّلاَمُ عَلَيْكَ اَيُّهَا النَّبِىُّ وَرَحمَهُ اللهِ وَبَرَكاتُهُ

Əssəlamu ələykə əyyuhən-Nəbiyyu və rəhmətullahi və bərəkatuh" Ey Peyğəmbər!"
!Allahın salam, rəhmət və bərəkəti Sənə olsun

السَّلاَمُ عَلَيْنا وَعَلى عِبادِ اللهِ الصّالِحِينَ

Əssəlamu ələyna və əla ibadillahis-salihin" Allahın salamı biz namaz qılanlara və"
!bütün əməli saleh bəndələrə olsun

السَّلاَمُ عَلَيكُم وَرَحمَهُ اللهِ وَبَرَكاتُهُ

Əssəlamu ələykum və rəhmətullahi və bərəkatuh"–Allahın salam, rəhmət və bərəkəti"
!siz mö'minlərə olsun

## NAMAZIN ŞƏKKİYYATI

### İŞARƏ

Bə'zi hallarda namaz qılan şəxs üçün namazın hissələrini yerinə yetirib-yetirməməsində şəkk irəli gələ bilər. Məsələn, təşəhhüdü oxuyub-oxumamasında, bir və ya iki səcdə etməsində şəkk edir. Bə'zən də qıldığı namazların rəkətlərinin sayında .şəkk edir. Məsələn, üçüncü və ya dördüncü rəkətdə olduğunu bilmir

Namazda irəli gələn şəklərin özünəməxsus hökmü vardır. Onların hamısını bu kitabda gətirmək olmaz, amma yığcam şəkildə şəkkin qismləri və onların hər birinin .hökmlərinin bəyanına başlayırıq

### NAMAZIN HİSSƏLƏRİNDƏ ŞƏKK

Məsələ:۲۶۹. Əgər bir kəs namaz əsnasında onun hissələrindən birini yerinə yetirib-yetirməməsində şəkk etsə, (yə'ni onu yerinə yetirib-yetirməməsini bilməsə) bu halda ondan sonra yerinə yetirilməli olan əmələ başlamamış olsa (yə'ni o hissənin məhəllindən keçməmiş olsa) şəkk etdiyi hissəni yerinə yetirməlidir. Amma ondan sonra yerinə yetirilməli olan işə məşğul olandan (yə'ni onun məhəlli keçəndən) sonra

şəkk hasil olsa, öz şəkkinə e’tina etməyib namazı davam etdirməlidir və namazı da .səhihdir

Məsələ:۲۷۰. Əgər namazın hər hansı bir hissəsini yerinə

yetirdikdən sonra onun səhih olub-olmamasında şəkk etsə, yə’ni yerinə yetirdiyi hissənin səhih olub-olmadığını bilməsə, bu halda öz şəkkinə e’tina etməməlidir. Yə’ni .belə qərara gəlməlidir ki, səhihdir və namazı davam etdirməlidir

## NAMAZI BATİL EDƏN ŞƏKLƏR

Məsələ:٢٧١. Əgər iki rəkətli namazda (sübh namazı kimi) yaxud məğrib namazının .rəkətlərində şəkk edərsə, namaz batildir

Məsələ:٢٧٢. Əgər bir rəkətlə birdən artıq rəkət arasında (məsələn, birlə iki, yaxud birlə .üç arasında) şəkk edərsə, namaz batildir

.Məsələ:٢٧٣. Əgər namaz əsnasında neçə rəkət qıldığını bilməsə namaz batildir

Məsələ:٢٧٤. Əgər batil edən şəklərdən hər hansı biri namazda insanın qarşısına çıxsa, bir az fikirləşməlidir. Əgər bir şey yadına düşməsə və şəkk yerində qalsa, namazı .pozub yenidən başlamalıdır

:Məsələ:۲۷۵. Dörd rəkətli namazın rəkətlərindəki şəkk

Niyyəti dördə qoyaraq namazı qurtarır, namazdan sonra bir rəkət ayaq üstə, yaxud iki rəkət oturan halda ehtiyat namazı qılır.

## E'TİNA EDİLMƏYƏN ŞƏKKLƏR

:Məsələ:۲۷۶. E'tina edilməyən şəklər aşağıdakılardan ibarətdir

;Müstəhəb namazda ⁕

;Camaat namazında ⁕

;Namazın salamından sonra ⁕

.Namazın vaxtı keçəndən sonra ⁕

Məsələ:۲۷۷. Əgər şəkkin ehtimal verilən çox tərəfi namazı batil edərsə gərək bəna aza qoyulsun. Məsələn, sübhün nafiləsində iki rəkətlə üç rəkət arasında şəkk etsə, gərək bənanı iki rəkət qılmasına qoysun. Əgər şəkkin ehtimal verilən çox tərəfi namazı batil etməzsə, məsələn, iki rəkətlə bir rəkət arasında şəkk etsə, onda şəkkin hər iki tərəfini .əsas tutub əməl etsə, namazı səhihdir

Məsələ:۲۷۸. Əgər imam namazın rəkətlərinin sayında şəkk etsə, amma mə'mum şəkk etməsə və imama neçənci rəkət olduğunu başa salsa, imam öz şəkkinə e'tina etməməlidir. Həmçinin əgər mə'mum şəkk etsə, amma imam şəkk etməsə, imamın .qıldığı kimi qılmalı və namazı qurtarmalıdır. Namazı da səhihdir

Məsələ:۲۷۹. Əgər insan namazın salamlarından sonra onun səhih olub-olmamasında şəkk etsə, (məsələn, rüku edib-etməməsində şəkk etsə, yaxud dörd rəkətli namazın salamından sonra dörd rəkət, yaxud beş rəkət qılmasında şəkk etsə) öz şəkkinə e'tina etməməlidir. Amma əgər şəkkinin hər iki tərəfi batil olsa (Məsələn, dörd rəkətli namazın salamından sonra üç rəkət, yaxud beş rəkət qılmasında şəkk etsə) namazı .batildir

Məsələ:۲۸۰. Əgər bir kəs namazın vaxtı keçəndən sonra namaz qılıb-qılmamasında şəkk etsə, yaxud qılmadığını güman etsə yenidən qılması lazım deyildir. Amma vaxtı keçməmişdən qabaq namaz qılıb-qılmamasında şəkk etsə, yaxud qılmadığını güman .etsə, o namazı qılmalıdır. Hətta əgər qıldığını güman etsə də, yenidən qılmalıdır

## EHTİYAT NAMAZI

Məsələ:٢٨١. Ehtiyat namazı vacib olan hallarda (məsələn, iki rəkətlə üç rəkət arasında şəkk etsə), salamdan sonra namazın surətini pozmadan, onu batil edən işlərdən hər hansını görmədən ayağa qalxıb azan və iqaməsiz, təkbir deyib ehtiyat namazı .qılmalıdır

Məsələ:٢٨٢. Ehtiyat namazının sair namazlardan fərqi: onun niyyəti dildə deyilməməlidir, Surəsi və qunutu yoxdur (hərçənd iki rəkət də olsa) və ahəstə .qılınmalıdır. Ehtiyat vacib budur ki, “bismillah”ı da ahəstə deyilsin

Məsələ:٢٨٣. Əgər bir rəkət ehtiyat namazı vacib olsa səcdələrdən sonra təşəhhüd oxunur və salam verilir. Əgər iki rəkət vacib olsa, birinci rəkətdə təşəhhüd və salam oxunmaz, əksinə bir rəkət də (təkbirətül ehramsız) qılınıb və ikinci rəkətin sonunda .təşəhhüd və salam deyilir

## SƏCDEYİ SƏHV

Məsələ:٢٨٤. Səcdeyi-səhv vacib olan hallarda (məsələn, oturan halda dörd rəkətlə beş :rəkət arasında şəkk etdikdə) gərək namazın salamından sonra səcdəyə gedib desin

Bismillahi və billahi və səlləllahu əla Muhəmmədin və Ali-Muhəmməd”, yaxud“

Bismillahi və billahi, Allahummə səlli əla Muhəmmədin və Ali-Muhəmməd”. Amma“ ,daha yaxşı olar ki

Bismillahi və billahi, əssəlamu ələykə əyyuhən-Nəbiyyu və rəhmətullahi və“ bərəkatuh” deyilsin. Sonra səcdədən qalxıb otursun, yenidən səcdəyə gedib yuxarıdakı zikrlərdən birini desin, səcdədən qalxıb otursun, təşəhhüd və salamları .desin

## MÜSAFİRİN NAMAZI

Məsələ:٢٨٥. İnsan səfərdə dörd rəkətli namazları şikəstə (yə’ni iki) rəkət qılmalıdır. Bu .şərtlə ki, səfəri ٨ fərsəxdən (təqribən ٤٥ km) az olmasın

yerdən (məsələn, öz vətəni kimi) aşağısı ۴ fərsəx gedib ۴ fərsəx də qayıtsa gərək bu .səfərdə namazı şikəstə qılsın

Məsələ:۲۸۷. Səfərə gedən şəxs namazı o vaxt şikəstə qılmalıdır ki, vətənindən şəhərin divarlarını görmədiyi, azanın səsini eşitmədiyi qədər uzaqlaşsın. Bu qədər .uzaqlaşmazdan qabaq namaz qılmaq istəsə, bütöv qılmalıdır

Məsələ:۲۸۸. Əgər bir məntəqəyə iki yol olsa və onlardan biri səkkiz fərsəxdən az, digəri isə səkkiz fərsəx, yaxud ondan çox olsa, bu halda bir kəs həmin yerə səkkiz fərsəx olan yolla getsə, namazı şikəstə qılmalıdır. Amma səkkiz fərsəxdən az olan yolla getsə, namazı bütöv, dörd rəkətli qılmalıdır. Məsələn, əgər vətənindən bir yolu dörd fərsəx, digər yolu isə üç fərsəx məsafədə olan kəndə birinci yolla (dörd fərsəxlik) gedib həmin yolla da qayıdarsa namazı yolda və getdiyi kənddə şikəstədir. Amma əgər bu yolla gedib başqa yolla (üç fərsəxlik) qayıtsa, yaxud ikinci yolla (üç fərsəxlik) gedib elə oradan da qayıtsa səfərin məcmusu səkkiz fərsəxdən az olduğu üçün yolda və o .kənddə namazı bütöv qılmalıdır

:Məsələ:۲۸۹. Aşağıdakı hallarda səfərdə namaz tamamdır

fərsəx getməmişdən əvvəl öz vətənindən keçsə, yaxud ۱۰ gün müəyyən bir yerdə ۱-۸ ;qalmaq istəsə

Əvvəlcədən ۸ fərsəx səfər etmək qəsdi olmadan bu qədər yol gedərsə (itirdiyi şeyin-۲ ;(ardınca gedən bir kəs kimi

;Yol əsnasında (yə’ni ۴ fərsəxə çatmazdan) səfər fikrini dəyişsə-۳

Bir kəsin işi müsafirət olsa; Məsələn, şəhərlərarası qatarların sürücüsü, təyyarəçi,–۴ .(dənizçi kimi (işlə bağlı olan səfərlərdə

Bir kəs haram səfərə gedərsə. Məsələn, ata və anasının əziyyətinə səbəb olan-۵ .səfərlər kimi

:Məsələ:۲۹۰. Bu yerlərdə də namaz tamam qılınar

;Vətəndə ❊

;gün qalmaq istədiyi yerdə ١٠ ⁕

gün tərəddüdlə qaldığı yerdə. Yə’ni həmin yerdə qalacağı və ya gedəcəyində ٣٠ ⁕ tərəddüddə qalsa və bu minvalla ٣٠ günədək o vəziyyətdə qalsa, başqa bir yerə də getməsə gərək ٣٠ gündən səh:٨٦

.sonra, namazını tam qılsın

## ?VƏTƏN HARADIR

Məsələ:۲۹۱. İnsanın yaşamaq üçün seçdiyi yer onun vətənidir: istər o yerdə dünyaya gəlmiş olsun və ata-anasının vətəni olsun, istərsə də onu həmişəlik yaşamaq üçün seçmiş olsun. Övlad valideynlə birlikdə yaşadığı, müstəqil olmadığı vaxta qədər valideynin vətəni elə onun da vətəni sayılır-hərçənd orada dünyaya gəlməmiş olsa da. Həyatında müstəqil olandan sonra başqa bir yeri həmişəlik yaşamaq üçün seçsə, ora onun vətəni olacaq. Misal üçün, bir kəsin valideyni isfahanlı olsa və işləmək üçün Şiraza gedib sonra qayıtmaq fikirləri olsa, bu halda övlad Şirazda doğulsa İsfahan onun ata-anasının vətəni olduğundan övlad onlarla birlikdə yaşadığı müddət ərzində .İsfahan onun üçün də vətən hökmündədir. Əgər ora getsə namazını bütöv qılmalıdır

Məsələ:۲۹۲. İnsanın öz əsli vətənindən başqa bir yerdə həmişəlik qalmaq qəsdi olmasa .ora onun vətəni hesab olunmur

Məsələ:۲۹۳. Əgər əsl vətəni olmayan bir yerdə müəyyən müddət qalıb sonra başqa bir yerə getmək istəsə, o yer onun vətəni hesab olunmur. (Təhsil almaq üçün bir müddət (.başqa şəhərdə qalan tələbələr kimi

Məsələ:۲۹۴. Əsli vətəni olmayan bir yerdə həmişəlik qalmaq və başqa yerə də getmək qəsdi olmayan bir insan o yerdə çox qalsa, nəticədə camaat oranı onun vətəni hesab .etsələr, bu halda o yer onun vətəni hökmündədir

Məsələ:۲۹۵. Bir kəs əvvəllər öz vətəni olan, hazırda isə vətəni sayılmayan (yə’ni sakin olmaq üçün oraya qayıtmaq qəsdində olmayan) bir yerə getsə, hətta özü üçün başqa .yeri vətən seçməsə də belə, orada namazı tamam qılmamalıdır

Məsələ:۲۹۶. Vətəninə qayıdan müsafir, vətəninin divarını gördüyü və azan səsini .eşitdiyi yerə çatanda, gərək namazı tamam qılsın

## GÜN QƏSD ETMƏK ۱۰

,Məsələ:۲۹۷. ۱۰ gün bir yerdə qalmaq fikrində olan müsafir

əgər orada ١٠ gündən artıq qalsa, nə qədər ki, (oradan başqa yerə) səfər etməyib, .gərək namazını tamam qılsın və yenidən ١٠ gün qalmağı qəsd etməsi lazım deyildir

:Məsələ:٢٩٨. Əgər müsafir ١٠ gün qalmaq məqsədindən dönsə, onda

a) Əgər dörd rəkətlik bir namaz qılmamışdan qabaq fikrindən dönsə, namazını şikəstə .qılmalıdır

b) Bir dörd rəkətli namaz qılandan sonra öz fikrindən dönsə, orada olduğu vaxta qədər .gərək namazını tamam qılsın

## QƏZA NAMAZI

Vaxtı keçəndən sonra qılınan namaza qəza namazı deyilir

Məsələ:٢٩٩. İnsan gərək öz vacib namazlarını onlar üçün müəyyən olunmuş vaxtda qılsın. Əgər üzürsüz səbəbə görə namazı qəzaya getsə, günahkardır; gərək tövbə .etsin və namazının qəzasını da qılsın

:Məsələ:٣٠٠. İki halda namazın qəzasını qılmaq vacibdir

;a) Vacib namazı vaxtında qılmasa

.b) Namaz vaxtı keçəndən sonra qıldığı namazın batil olduğunu başa düşsə

Məsələ:٣٠١. Boynunda qəza namazı olan bir kəs onu qılmaqda süstlük, səhlənkarlıq .etməməlidir. Amma dərhal yerinə yetirməsi vacib deyil

Məsələ:٣٠٢. Ehtiyat vacibə görə gündəlik namazların qəzasını qılanda gündəlik tərtibə riayət olunmalıdır. Məsələn, birinci gün əsr, ikinci gün isə zöhr namazını qəzaya verən .bir kəs, əvvəlcə əsrin qəzasını, sonra isə zöhrün qəzasını qılmalıdır

Məsələ:٣٠٣. Əgər bir kəs, qəza namazı olduğunu bilsə, amma onların sayını (məsələn, dörd, yaxud beş olduğunu) bilməsə, bu halda (şəkk etdiyi) az miqdarın qəzasını qılsa, .kifayətdir

Məsələ:٣٠٤. Əgər əvvəllər qəza namazının sayını bilib sonra unudubsa, ehtiyat vacib

.budur ki, çox tərəfi yerinə yetirsin

Məsələ:٣٠٥. Qəza namazını camaat namazı ilə birlikdə qılmaq olar–istər imamın namazı əda olsun, istərsə də qəza. Hər ikisinin də (imam və mə’mum) eyni namazı qılmaları lazım (ilzami) deyil. səh:٨٨

Məsələn, sübh namazının qəzasını imamın zöhr və ya əsr namazı ilə birlikdə qılsa, eybi .yoxdur

Məsələ:۳۰۶. Səfərdə namazını şikəstə qılmalı olan bir kəsin zöhr, əsr və ya işa namazı qəzaya getsə, qəzasını iki rəkətlə yerinə yetirməlidir–hətta səfərdə olmayan vaxtlarda .da qılmaq istəsə belə

Məsələ:۳۰۷. Səfərdə oruc tutmaq olmaz. Hətta qəza orucu da. Amma qəza namazı .qılmağın eybi yoxdur

Məsələ:۳۰۸. Əgər bir kəs səfərdə olmadığı vaxt qılmadığı namazın qəzasını səfərdə .qılmaq istəsə, zöhr, əsr və işa namazlarını bütöv qılmalıdır

Məsələ:۳۰۹. Qəza namazlarını hər vaxt yerinə yetirmək olar, yə'ni misal üçün, sübh .namazının qəzasını, günorta və ya gecə qılmaq olar

## ATA–ANANIN QƏZA NAMAZI

Məsələ:۳۱۰. Nə qədər ki insan diridir, hətta öz qəza namazlarını qıla bilməsə də, .başqası (naibi) onun qəza namazlarını qıla bilməz

Məsələ:۳۱۱. Böyük oğula vacibdir ki, atanın vəfatından sonra, onun yerinə yetirmədiyi .oruc-namazın qəzasını etsin

Ehtiyat vacib budur ki, böyük oğul anasının da oruc-namazlarının qəzasını yerinə .yetirsin

## CAMAAT NAMAZI

### İŞARƏ

İslam ümmətinin vəhdəti İslamın müstəsna əhəmiyyət verdiyi məsələlər sırasındadır ki, onun qorunub davam etdirilməsi üçün xüsusi proqramları vardır. Onlardan biri də camaat namazıdır. Camaat namazında müəyyən xüsusiyyətlərə malik olan bir nəfər camaatın önündə durur, yerdə qalanlar isə nizamlı cərgələrlə onun arxasında durub .onunla ahəngdar surətdə namaz qılırlar

Birlikdə qılınan bu namazın önündəki şəxsə imam-camaat, onun arxasında duran və namazda ona tabe olan şəxsə mə’mum deyilir.

## CAMAAT NAMAZININ ƏHƏMİYYƏTİ

Rəvayətlərdə camaat namazı üçün çoxlu savab qeyd olunmuşdur. Əhkamın bə’zi məsələlərinə diqqət etməklə bu ibadətin əhəmiyyətini dərk edirik. Onlardan bə’zilərini :qeyd edirik

Məsələ:۳۱۲. Camaat namazında iştirak etmək hamı üçün, məxsusən məscidə qonşu .olanlar üçün müstəhəbdir

.Məsələ:۳۱۳. Müstəhəbdir ki, insan gözləsin və namazı camaatla qılsın

Məsələ:۳۱۴. Camaatla qılınan namaz, əvvəl vaxtda təklikdə (furada) qılınan namazdan .daha yaxşıdır

Məsələ:۳۱۵. Müxtəsər və qısa şəkildə qılınan camaat namazı təklikdə uzun-uzadı .qılınan namazdan daha yaxşıdır

.Məsələ:۳۱۶. İnsanın üzrü olmadan camaat namazına getməməsi layiq deyil

.Məsələ:۳۱۷. E’tinasızlıq üzündən camaat namazında iştirak etməmək caiz deyildir

## CAMAAT NAMAZININ ŞƏRTLƏRİ

:Məsələ:۳۱۸. Camaat namazı bərqərar olanda aşağıdakı şərtlərə riayət olunmalıdır

Mə’mum imamdan qabaqda durmamalıdır; ehtiyat vacib budur ki, azacıq ondan-۱ .arxada dursun

;İmamın dayandığı yer mə’mumun dayandığı yerdən uca olmamalıdır-۲

İmamla mə’mumun, habelə cərgələrin arasında olan fasilə çox olmasın; Ehtiyata-۳ .görə fasilə bir addımdan artıq olmamalıdır

Mə’mumla imam, həmçinin cərgələrin arasında arxası görünməyən pərdə, divar və-۴ bu kimi şeylər fasilə salmamalıdır. Amma qadınlarla kişilərin cərgələri arasında pərdə .və bu kimi şeylərin olmasının eybi yoxdur

Məsələ:۳۱۹. İmam camaat həddi-büluğa çatmış, adil olmalı, namazı səhih tərzdə

Məsələ:٣٢٠. Hər rəkətdə təkcə qiraətin əsnasında və rükuda imama iqtida etmək olar. Deməli əgər imamın rükusuna çatmasa, sonrakı rəkətdə iqtida etməlidir və hətta .imamın təkcə rükusuna da çatsa, bir rəkət hesab olunar

:Məsələ:٣٢١. Camaat namazına qoşulmağın müxtəlif halları

### BİRİNCİ RƏKƏTDƏ

Qiraət əsnasında: Mə’mum həmd və surəni oxumur, qalan əməlləri imam ilə birlikdə-١ .yerinə yetirir

.Rükuda: rükunu və ondan sonrakı əməlləri imamla birlikdə yerinə yetirir-٢

### İKİNCİ RƏKƏTDƏ

Qiraət əsnasında: Mə’mum həmd və surəni oxumur, amma imamla qunut, rüku və-١ səcdəni yerinə yetirir, imam təşəhhüd oxuyan vaxt ehtiyat vacibə görə, gərək yarım oturmuş vəziyyətdə(١)oturmalı, namaz iki rəkətlidirsə, o biri rəkətini də təklikdə qılıb namazı tamamlamalıdır. Əgər iki və ya üç rəkətlidirsə, imamın üçüncü rəkəti, onun isə ikinci rəkəti olur və həmd-surəni oxumalıdır (hərçənd imam təsbihati-ərbəəni oxusa da). İmam üçüncü rəkəti tamamlayıb dördüncü rəkəti qılmağa başlayanda, o, gərək səcdədən sonra təşəhhüdü oxusun. Sonra üçüncü rəkəti qılmaq üçün ayağa durmalı, namazın axırında, imam təşəhhüd və salamı deyib namazı qurtaranda, o, daha bir .rəkət qılmalıdır

Rükuda: Rükunu imamla birlikdə, qalan əməlləri isə qabaqda deyildiyi kimi yerinə-٢ .yetirməlidir

### ÜÇÜNCÜ RƏKƏTDƏ

Qiraət əsnasında: Əgər iqtida edəcəyi halda həmd və surəni, yaxud təkcə həmdi-١ oxumağa vaxtı olacaqsa, iqtida edə bilər. Bu səh:٩١

---

.Buna təcafi deyilir[٥١] -١

halda həmd və surəni, yaxud təkcə həmdi oxumalıdır. Əgər fürsət olmayacağını bilsə, .ehtiyat vacibə görə imamın rükuya getməsini gözləyib, sonra iqtida etməlidir

Rükuda: Əgər rükuda iqtida etsə rükunu imamla birlikdə yerinə yetirməlidir və-۲ həmin rəkətin həmd və surəsi saqitdir. Namazın qalan hissəsini əvvəldə bəyan edildiyi .kimi yerinə yetirməlidir

### DÖRDÜNCÜ RƏKƏTDƏ

Qiraət əsnasında: Üçüncü rəkətdə iqtida etmək kimidir. İmam axırıncı rəkətdə-۱ təşəhhüd və salam üçün oturanda, mə’mum həm ayağa qalxıb təklikdə namazı davam etdirə bilər, həm də imamın təşəhhüd və salamı qurtarana qədər yarım oturan halda .gözləyə, sonra ayağa durub namazı davam etdirə bilər

Rükuda: Rükunu və səcdələri imamla birlikdə yerinə yetirməlidir. (İmamın namazının-۲ dördüncü, mə’mumun isə birinci rəkəti olur.) Namazın qalan hissələrini də qeyd .olunduğu qayda üzrə yerinə yetirməlidir

### CAMAAT NAMAZININ HÖKMLƏRİ

Məsələ:۳۲۲. Pişnamaz gündəlik namazlardan birini qılanda gündəlik namazlardan hər birini ona iqtida edib qılmaq olar. Deməli, əgər imam əsr namazını qılırsa mə’mum zöhr namazını ona iqtida edərək qıla bilər. Əgər bir kəs zöhr namazını qıldıqdan sonra camaat namazı təşkil olunsa əsr namazını imamın zöhr namazına iqtida edərək qıla .bilər

Məsələ:۳۲۳. Mə’mum özünün qəza namazını imamın əda namazına (hərçənd başqa gündəlik namazın qəzası olsa da) iqtida edərək qıla bilər. Məsələn, imam zöhr .namazını qılanda mə’mum sübhün qəzasını ona iqtida edərək qıla bilər

Məsələ:۳۲۴. İki nəfər camaat namazı təşkil edə bilərlər. Onlardan biri imam, digəri isə .mə’mum. Amma iki nəfər cümə namazı təşkil edə bilməz

Məsələ:۳۲۵. Yağış yağması üçün qılınan istisqa namazı istisna olmaqla müstəhəb .namazları camaatla birlikdə qılmaq olmaz

Məsələ:۳۲۶. Mə’mum təkbirətül-ehramı imamdan qabaq deməməlidir. Üstəlik ehtiyat .vacib budur ki, imam təkbirətül-ehramı qurtarmayınca təkbir deməsin

Məsələ:۳۲۷. Mə’mum Həmd-Surə istisna olmaqla, namazın qalan hissələrinin hamısını özü deməlidir. Amma əgər onun birinci və ya ikinci rəkəti, imamın isə üçüncü və ya .dördüncü rəkəti olsa, Həmd-Surəni də oxumalıdır

## CÜMƏ NAMAZI

Müsəlmanların həftəlik ictimai toplantılarından biri cümə namazıdır. Namaz qılanlar cümə günü günorta namazının yerində cümə namazı qıla bilərlər. Bu, zöhr .namazından daha yaxşıdır

Cümə namazının fəzilətlərindən biri də budur ki, Qur’anda onun adına surə gəlmişdir. .Bu surə mö’minləri cümə namazında iştirak etməyə də’vət edir

## CÜMƏ NAMAZININ QILINMA QAYDASI

Məsələ:۳۲۸. Cümə namazı iki rəkətdən ibarətdir və eynilə sübh namazı kimi qılınır. .Amma onun iki xütbəsi vardır ki, imam-cümənin vasitəsi ilə oxunur

Məsələ:۳۲۹. Müstəhəbdir ki, cümə namazında imam-cümə Həmd-Surəni uca səslə .oxusun

Məsələ:۳۳۰. Cümə namazında müstəhəbdir ki, birinci rəkətdə Həmddən sonra “Cümə’ .surəsi, ikinci rəkətdə isə “Münafiqun” surəsi oxunsun

Məsələ:۳۳۱. Cümə namazında iki qunut müstəhəbdir. Birinci qunut birinci rəkətin .rükusundan əvvəl, ikinci qunut isə ikinci rəkətin rükusundan sonra yerinə yetirilir

## CÜMƏ NAMAZININ ŞƏRTLƏRİ

.Məsələ:۳۳۲. Cümə namazında aşağıdakı şərtlərə riayət edilməlidir

❊ Camaat namazındakı bütün şərtlər cümə namazında da mö’təbərdir.

❊ Cümə namazı camaat namazı şəklində olmalıdır və fərdi şəkildə səhih deyildir;

❊ Cümə namazının bərqərar olması üçün lazım olan ən az say beş nəfərdir ki, onlardan biri imam, dördü isi mə’mum olmalıdır. İki cümə namazı arasında ən azı bir fərsəx məsafə olmalıdır.

## CÜMƏ NAMAZI QILANLARIN VƏZİFƏLƏRİ

Məsələ:۳۳۳. Vacibdir ki, mə’mumlar imamın xütbələrinə qulaq assınlar.

Məsələ:۳۳۴. Ehtiyat müstəhəb budur ki, mə’mumlar xütbə oxunan vaxtda sakit olsunlar və bir-biri ilə söhbət etməsinlər.

Məsələ:۳۳۵. Ehtiyat müstəhəb budur ki, mə’mumlar xütbə oxunanda üzləri imam-cüməyə tərəf olub o yana-bu yana baxmasınlar.

Məsələ:۳۳۶. Əgər insan cümə namazının birinci rəkətinə çatmasa və özünü ikinci rəkətə, hətta onun rükusuna çatdırsa belə, namazı səhihdir. İkinci rəkəti də özü qılmalıdır. Bu şərtlə ki, ikinci rəkətin namaz vaxtında vaqe olacağı üçün vaxt olduğunu bilsin.

## AYƏT NAMAZI

Məsələ:۳۳۷. Vacibi namazlardan biri ayət namazıdır ki aşağıdakı hadisələrin səbəbilə vacib olur:

❊ Zəlzələ;

❊ Günəşin və ayın tutulması;

❊ İldırım, şimşək, qara-qırmızı küləklər və s. kimi şeylər (o halda namaz vacib olur ki, camaatın əksəriyyəti qorxsun).

## AYƏT NAMAZININ QILINMASI QAYDASI

Məsələ:۳۳۸. Ayət namazı iki rəkətdir və hər rəkətində beş rüku vardır. Hər rükudan

qabaq, əvvəlcə “Həmd” surəsi, sonra isə başqa bir surə oxunmalıdır. (Yə’ni iki rəkətdə on həmd və on surə səh:۹۴

oxunur.) Amma bir surəni beş yerə bölüb hər rükudan qabaq onun bir hissəsini .oxumaq da olar. Bu halda iki rəkətdə iki həmd və iki surə oxunacaq

:Burada ixlas surəsini bölməklə ayət namazının qaydasını qeyd edirik

Birinci rəkət: Təkbirətül-ehramdan sonra Həmdi oxuyub sonra “Bismillahir-rəhmanir-.rəhim” deyib rükuya getsin

.Sonra qalxıb “Qul huvəllahu əhəd” deyib yenidən rükuya getsin

.Sonra qalxıb “Allahus-səməd” deyib rükuya getsin

Sonra qalxıb “ləm yəlid və ləm yuləd” deyib rükuya getsin, sonra qalxıb “və ləm yəkun ləhu kufuvən əhəd” deyib beşinci rükuya getsin. Rükudan qalxıb iki səcdə etsin, sonra ayağa qalxıb ikinci rəkəti də eynilə birinci rəkət kimi yerinə yetirsin, ikinci səcdədən .sonra təşəhhüd və salamları deyib namazı qurtarsın

## AYƏT NAMAZININ HÖKMLƏRİ

Məsələ:۳۳۹. Ayət namazının vacib olduğu şeylər bir şəhərdə baş versə, təkcə o şəhərin .əhalisi ayət namazı qılmalıdır, başqa yerlərin əhalisinə isə vacib deyil

Məsələ:۳۴۰. Əgər ayət namazının bir rəkətində beş dəfə Həmd-Surə oxusa, o biri .rəkətində isə Həmd oxuyub Surəni beş yerə bölsə, səhihdir

Məsələ:۳۴۱. Müstəhəbdir ki, ۲, ۴, ۶, ۸ və ۱۰-cu rükulardan qabaq qunut tutulsun. Əgər .۱۰-cu rükudan qabaq bir qunut tutulsa kifayətdir

Məsələ:۳۴۲. Ayət namazının hər rükusu rükndür; əgər qəsdən və ya səhvən azaldılıb-.artırılsa, namaz batildir

Ayət namazını camaat namazı şəkilində də qılmaq olar. Belə olanda “Həmd” və .“Surə’ni təkcə imam oxumalıdır

## MÜSTƏHƏB NAMAZLAR

### İŞARƏ

(۱)

Məsələ:۳۴۳. Müstəhəb namazlar çoxdur. Onların hamısının



---

.Müstəhəb namazlara nafilə deyilir[۵۲] -۱

.şərhi bu kitaba sığmaz. Amma mühüm əhəmiyyət kəsb edənləri qeyd edirik

### BAYRAM NAMAZI

Məsələ:۳۴۴. Fitr və Qurban bayramlarında məxsus bayram namazı qılmaq .müstəhəbdir

### BAYRAM NAMAZININ VAXTI

.Məsələ:۳۴۵. Bayram namazının vaxtı gün çıxan vaxtdan zöhrə qədərdir

Məsələ:۳۴۶. Müstəhəbdir ki, Fitr bayramında gün qalxandan sonra iftar edib fitrə .zəkatı(۱)verəndən sonra bayram namazı qılsınlar

### BAYRAM NAMAZININ QILINMA QAYDASI

:Məsələ:۳۴۷. Bayram namazı iki rəkətir. Bu namaz doqquz qunutla belə qılınır

Birinci rəkətdə Həmd-Surədən sonra beş təkbir deyilməli, hər təkbirdən sonra bir ⁕ qunut tutulmalıdır. Beşinci qunutdan sonra isə bir təkbir deyib rüku və iki səcdəni .yerinə yetirmək lazımdır

İkinci rəkətdə isə Həmd-Surədən sonra dörd təkbir deyilməli, hər təkbirdən sonra bir ⁕ qunut tutub beşinci təkbirdən sonra rüku, səcdəni yerinə yetirib təşəhhüd və salamı .demək lazımdır

Bayram namazının qunutunda hər hansı dua oxunsa, kifayətdir. Amma daha yaxşı ⁕ :olar ki, aşağıdakı dua oxunsun

Allahummə əhləl-kibriyai vəl-əzəməti və əhəl-cudi vəl-cəbərut. Və əhləl-əfvi vər-“ rəhməti və əhlət-təqva vəl-məğfirəti əs’alukə bi həqqi hazəl-yovm. Əlləzi cə’əltəhu lil-musliminə iyda. Və li Muhəmmədin səlləllahu ələyhi və alihi zuxrən və şərəfən və kəramətən və məziyda. Ən tusəlliyə əla Muhəmmədin və Ali-Muhəmməd və ən tudxiləni fi kulli xəyrin ədxəltə fihi

١- [٥٣] Fitrə zəkatı mali vaciblərdəndir ki, Fitr bayramı günü verilməlidir.

Muhəmmədən və Alə Muhəmməd. Və ən tuxricəni min kulli su’in əxrəctə minhu Muhəmmədən və Alə Muhəmməd. Sələvatukə ələyhi və ələyhim. Allahummə inni əs’əlukə xəyrə ma səələkə bihi ibadukəs-salihun, və əuzu bikə mimməstəazə minhu .ibadukəl-muxləsun

### GECƏ–GÜNDÜZÜN NAFİLƏLƏRİ

Gecə-gündüz namazların nafilələri cümə günü istisna olmaqla ۳۴ rəkətdən ibarətdir ki, səkkiz rəkəti zöhrün, səkkiz rəkəti əsrin, dörd rəkəti məğribin, iki rəkəti işanın, on bir rəkəti gecə namazının və iki rəkəti sübh namazının nafiləsidir. Bu namazların çoxlu (savabı vardır.(۱

### GECƏ NAMAZI

Məsələ:۳۴۸. Gecə namazın on bir rəkətdir ki, səkkizi gecə namazı (dörd dənə iki rəkətli), .iki rəkəti şəf’ namazı, bir rəkəti də vətr namazı niyyəti ilə qılınmalıdır

### GECƏ NAMAZININ VAXTI

Məsələ:۳۴۹. Gecə namazının vaxtı gecə yarısından sübh namazına qədərdir. Daha .yaxşı olar ki, sübh namazına yaxın vaxtlarda qılınsın

Məsələ:۳۵۰. Müsafir və gecə namazını gecə yarısından sonra qılmağı çətin olan bir kəs, .onu gecənin əvvəlində qıla bilər

### ĞÜFEYLƏ NAMAZI

Məsələ:۳۵۱. Müstəhəb namazlardan biri ğüfeylə namazıdır ki, məğrib və işa namazları .arasında qılınır

### ĞÜFEYLƏ NAMAZININ QAYDASI

Məsələ:۳۵۳. Ğüfeylə namazı iki rəkətdən ibarətdir ki, birinci rəkətdə Həmddən sonra bu :ayəni oxumaq lazımdır

Gecə-gündüzün nafilələri ilə daha artıq tanış olmaq üçün “Tovzihul-məsail”[۵۴] -۱ .risaləsinin ۷۶۴-cü məsələsinə baxın

Və zənnuni iz zəhəbə muğazibən fə zənnə ən lən nəqdirə ələyhi fə nada fizzulumati“ ən la ilahə illa əntə subhanəkə inni kuntu minəzzaliminə, fəstəcəbna ləhu və ”.nəccəynahu minəl-ğəmmi və kəzalikə nuncil-mu’minin

:İkinci rəkətdə isə Həmddən sonra bu ayəni oxumaq lazımdır

Və indəhu məfatihul-ğəybi la yə’ləmuha illa hu, və yə’ləmu ma fil-bərri vəl-bəhri və“ ma təsqutu min vərəqətin illa yə’ləmuha və la həbbətin fi zulumatil-ərzi və la rətbin və ”.la yabisin illa fi kitabin mubin

:Qunutda isə bu duanı oxumaq lazımdır

Allahummə inni əs’əlukə bi məfatihil-ğəybilləti la yə’ləmuha illa əntə ən tusəlliyə əla“ Muhəmmədin və Ali-Muhəmmədin və ən təf’ələ bi... Allahummə əntə vəliyyu ne’məti, vəl-qadiru əla təlibəti, tə’ləmu hacəti, fə əs’əlukə bi həqqi Muhəmmədin və Ali-Muhəmməd, ələyhi və ələyhimussəlam ləmma qəzəytəha li.” (Duada nöqtələrin yerinə (.öz hacət və istəyini diləsin

## ORUC

### İŞARƏ

İslamın vacib əməllərindən və insanları kamal həddinə çatdırmaq üçün olan .göstərişlərindən biri də orucdur

Oruc o əməldir ki, insan Allah-Taalanın fərmanını yerinə yetirmək üçün sübh .azanından məğribə qədər qeyd olunacaq işlərdən pərhiz etsin

### ORUCUN NİYYƏTİ

Məsələ:۳۵۳. Oruc ibadətlərdən biridir və gərək Allahın əmrinə itaət etmək üçün yerinə .yetirilsin. Elə bu orucun niyyətidir

Məsələ:۳۵۴. İnsan gərək mübarək Ramazan ayının hər gecəsində, sübh açılan zaman o günün orucu üçün niyyət etsin; istər əvvəl niyyət etmiş olsun, istərsə də etməmiş .olsun

Məsələ:۳۵۵. İnsanın oruc niyyətini dildə deməsi vacib deyil. Hətta əgər Allahın əmrini yerinə yetirmək üçün sübh azanından məğribə qədər orucu batil edən işləri görməsə .kifayətdir

## ORUCU BATİL EDƏN ŞEYLƏR

Oruc tutan şəxs sübh azanından günbatana qədər bə'zi işlərdən pərhiz etməlidir. :۳۵۶ Əgər onlardan birini görsə, oruc batil olur. Bu işlərin məcmusuna "orucu batil edən :işlər" deyilir. O cümlədən

;Yemək və içmək ⁕

;Qəliz tozu boğaza çatdırmaq ⁕

;Başın hər yerini suya batırmaq ⁕

.Qusmaq ⁕

## ORUCU BATİL EDƏN ŞEYLƏRİN HÖKMLƏRİ

YEMƏK VƏ İÇMƏK

.Məsələ:۳۵۷. Əgər oruc tutan şəxs qəsdən bir şey yesə və ya içsə orucu batil olar

Məsələ:۳۵۸. Əgər oruc tutan şəxs dişlərinin arasında qalan bir şeyi qəsdən udsa orucu .batil olar

.Məsələ:۳۵۹. Ağız suyunu udmaq–hətta çox da olsa, orucu batil etmir

Məsələ:۳۶۰. Əgər oruc tutan şəxs oruc olduğunu unudaraq bir şey yesə və ya içsə .orucu batil olmaz

Məsələ:۳۶۱. İnsan zəifliyə görə orucunu yeyə bilməz. Amma onun zəifliyi həddindən .artıq olsa və adətən dözə bilməsə, orucu yeməsinin eybi yoxdur

## İYNƏ VURDURMAQ

Məsələ:۳۶۲. Oruc tutan şəxs qida maddələri əvəzində iynə vurdurmaqdan çəkinməlidir. .Amma sair ampulalardan istifadə etməyin eybi yoxdur

## QƏLİZ TOZU BOĞAZA ÇATDIRMAQ

Məsələ:۳۶۳. Əgər oruc tutan şəxs, qəliz tozu boğazına çatdırsa orucu batildir. İstər

.(istərsə də sair tozlardan (torpaq tozu kimi

.Ehtiyat vacibə görə qəliz buxar, siqaret və tənbəki tüstüsü orucu batil edir

### BAŞI TAMAMİLƏ SUYA SALMAQ

Məsələ:۳۶۴. Əgər oruc tutan şəxs başının hər yerini qəsdən suya batırsa, ehtiyat-vacibə görə orucu batildir.

Məsələ:۳۶۵. Əgər oruc tutan şəxs ixtiyarsız olaraq suya düşsə və başının hamısı suya batsa; yaxud oruc olduğunu unudub başını suya batırsa orucu batil olmaz. Amma başa düşən kimi, dərhal sudan çıxarmalıdır.

### QUSMAQ

Məsələ:۳۶۶. Əgər oruc tutan şəxs qəsdən qussa–hətta xəstəlik səbəbilə olsa da orucu batildir.

Məsələ:۳۶۷. Əgər oruc tutan şəxs oruc oduğunu bilmədən, yaxud ixtiyarsız olaraq qussa, eybi yoxdur.

### ORUCUN QƏZA VƏ KƏFFARƏSİ

#### QƏZA ORUCU

Məsələ:۳۶۸. Əgər bir kəs Ramazan ayının orucunu öz vaxtında tutmasa, yaxud onu batil etsə Ramazan ayından sonra onun qəzasını tutmalıdır.

#### ORUCUN KƏFFARƏSİ

Məsələ:۳۶۹. Əgər bir kəs üzrlü səbəb olmadan öz orucunu, orucu batil edən şeylərin biri ilə batil etsə, onda onun qəzasını tutub, aşağıdakı işlərdən birini də etməlidir. (Bunlara kəffarə deyilir). Ramazan ayının orucunun kəffarəsi vacib olan bir kəs:

❊ ya bir qul azad etməlidir;

❊ ya iki ay oruc tutmalıdır (əvvəldəki ۳۱ günü dalbadal, arada fasilə olmadan

müdd(١)təam verməlidir. Əgər bir kəsə kəffarə vacib olsa bu işlərdən birinə əməl etməlidir. Amma indiki zamanda özünün fiqhi mə’nasında qul tapılmadığından ikinciyə .və ya üçüncüyə əməl etməlidir

Əgər bir şəxs üçün bunların heç biri mümkün olmasa, gərək on səkkiz gün oruc tutsun, yaxud neçə müddə gücü çatarsa o qədər də fəqirə təam versin. Əgər verə bilməsə, .istiğfar etməli, ehtiyat-vacibə görə hər vaxt imkanı olsa, kəffarə verməlidir

## ORUCUN QƏZA VƏ KƏFFARƏSİNİN HÖKMLƏRİ

Məsələ:٣٧٠. Qəza orucunu o saat tutmaq lazım (ilzami) deyildir, amma vacib ehtiyat .odur ki, növbəti ilin Ramazan ayına qədər tutsun

Məsələ:٣٧١. İnsan kəffarəni yerinə yetirməkdə səhlənkarlıq etməməlidir. Amma dərhal yerinə yetirməsi də vacib deyil. Əgər bir neçə il onu verməsə, üstünə bir şey əlavə .olunmur

Məsələ:٣٧٢. Əgər insan Ramazan ayında müəyyən üzr səbəbilə (məsələn, səfərə getmək kimi) oruc tutmasa və Ramazan ayından sonra üzrü aradan qalxsa, amma növbəti Ramazan ayına qədər onların qəzasını qəsdən tutmasa, gərək onların qəzasını .etməkdən əlavə, hər gün üçün də bir müdd təam fəqirə versin

Məsələ:٣٧٣. Əgər insan xəstəlik üzündən orucunu tutmasa və xəstəliyi növbəti ilin Ramazan ayına qədər uzansa onun qəzası saqitdir, gərək hər gün üçün fəqirə bir .müdd təam versin

## MÜSAFİRİN ORUCUNUN HÖKMLƏRİ

Məsələ:٣٧٤. Dörd rəkətli namazları səfərdə iki rəkət qılmalı olan müsafir, oruc tuta bilməz. Amma onun qəzasını tutmalıdır. Namazını bütöv qılan müsafir isə (məsələn, işi .səfər olan şəxs) səfərdə orucunu tutmalıdır

Məsələ:٣٧٥. Əgər oruc tutan şəxs zöhrdən sonra səfər etsə, orucunu tamamlamalıdır .və səhihdir

Məsələ:٣٧٦. Əgər zöhrdən qabaq səfər etsə, tərəxxüs həddinə

yə’ni şəhərin divarlarının görünmədiyi və azan səsinin eşidilmədiyi yerə) çatanda öz) orucunu batil etməlidir. Əgər o həddə çatmamışdan qabaq batil edərsə, qəzasından .əlavə, ehtiyat-vacibə görə kəffarə də vacib olur

Məsələ:٣٧٧. Ramazan ayında səfərə çıxmağın eybi yoxdur. Amma orucdan boyun .qaçırmaq üçün səfər etmək məkruhdur

Məsələ:٣٧٨. Əgər müsafir zöhrdən qabaq öz vətəninə, yaxud on gün qalmaq istədiyi yerə çatsa, bu halda orucu batil edən işlərdən görməyibsə, o günü oruc tutmalıdır; yox əgər orucu batil edən işlərdən birini görmüşsə o günün orucu vacib deyil və gərək .sonra qəzasını tutsun

Məsələ:٣٧٩. Əgər müsafir zöhrdən sonra vətəninə, yaxud on gün qalmaq istədiyi yerə .çatsa, o günü oruc tuta bilməz

## FİTRƏ ZƏKATI

Məsələ:٣٨٠. Mübarək Ramazan ayı qurtarandan sonra (yə’ni Fitr bayarmı günündə) .insan öz malının bir miqdarını fitrə zəkatı kimi fəqirə verməlidir

Məsələ:٣٨١. İnsan özü və onun çörək yeyənləri sayılan hər nəfərin tərəfindən (yoldaşı .və övladları kimi) bir sa” (təqribən ٣ kq) fəqirə verməlidir

## FİTRƏ ZƏKATININ CİNSİ

Məsələ:٣٨٢. Fitrə zəkatı buğda, arpa, xurma, kişmiş, düyü, qarğıdalı və bu kimi .şeylərdən olmalıdır. Əgər onlardan birinin pulunu da versə, kifayətdir

## XUMS

Müsəlmanların iqtisadi məsələlərindən biri də xumsdur. Yə’ni bə’zi şeylərin beşdə bir hissəsi müəyyən edilmiş işlərə sərf olunmaq üçün İslam hakiminə (müctehidə) .verilməlidir

:Məsələ:٣٨٣. Yeddi şeydə xums vacibdir

;Qazanc mənfəəti ❊

;Harama qarışmış halal mal ❊

;Suyun dibinə getməklə əldə edilən cəvahirat ❊

;Müharibə qənimətləri ❊

.Zimmi kafirin(١)müsəlmandan aldığı torpaq ❊

Məsələ:٣٨۴. Xumsun verilməsi də oruc və namaz kimi vacibdir. Bütün aqil və həddi-büluğa çatmış adamlar bu yeddisindən birinə malik olsalar, gərək ona əməl etsinlər.

O hallardan biri və camaatın əksəriyyətinə şamil olanı insanın özünün və ailəsinin illik xərclərindən artıq qalan şeyin xumsudur.

İslamda insanların kəsb-karına ehtiram qoyulur. Onların ehtiyaclarının tə'min olunması xumsdan öncəyə keçirilir. Deməli, bir insan il boyu bütün ehtiyaclarını qazancından tə'min edirsə və ilin axırına əlavə heç nə qalmırsa, xums ona vacib olmaz. Amma əgər adi, normal qaydada, öz ehtiyacları həddində güzəranını keçirsə (məsrəfdə nə çox ifrata varsa, nə də çox təfrit edib çətinliklə dolansa) ilin axırında öz ehtiyaclarından artıq bir şey qalarsa, onun beşdə birini xums kimi verib beşdə dördünü özünə ehtiyat saxlasın.

## XUMSUN HÖKMLƏRİ

Məsələ:٣٨۵. Nə qədər ki, malın xumsu verilməyib, onda təsərrüf etmək olmaz. Yə'ni xumsu verilməyən azuqəni yeyə bilməz. Yaxud xumsu verilməyən pulla bir şey ala bilməz.

Məsələ:٣٨۶. Əgər bir illik qazanc mənfəətindən həmin ildə məsrəf olunacaq azuqə (düyü, yağ, çay və s.) alsa və ilin axırında artıq qalsa, artıq qalanın xumsunu verməlidir.

Məsələ:٣٨٧. Əgər həddi-büluğa çatmayan (səğir) uşağın sərmayəsi olsa və ondan müəyyən mənfəət ələ gəlsə uşağın qəyyumu (ata və ata tərəfindən olan baba) onun xumsunu verməlidir.

İslam hökuməti ilə peyman bağlayıb müəyyən məbləğdə maliyyə verən və fiqhi[۵۶] -۱ kitablarda deyilən və xas şərtləri qəbul edən, bunun müqabilində canları və malları .amanda qalan məsihi, yəhudi və zərdüştlər zimmi kafirdir

## XUMSUN XƏRCLƏNMƏSİ

Məsələ:۳۸۸. Malın xumsu iki yerə bölünməlidir: bir qismi ehtiyat-vacibə görə cameüş-şərait müctehidə, ya da onun icazəsi ilə fəqir, yetim, yaxud da səfərdə yolda qalmış seyyidlərə verilməlidir. Digər yarısı isə İmam (əleyhis-salam)-ın payıdır ki, o da .cameüş-şərait müctehidə, yaxud onun nümayəndəsinə verilməlidir

## ZƏKAT

Müsəlmanların mühüm iqtisadi vəzifələrindən biri də zəkat verməkdir. Zəkatın əhəmiyyətindən biri kimi bunu qeyd etmək lazımdır ki, Qur’ani Məciddə namazdan .sonra gəlmiş və imanın əlaməti, nicat tapma amili kimi qeyd olunmuşdur

Mə’sum imamlarımızdan (əleyhimüssalam) gələn çoxlu rəvayətlərdə buyurulur: “Hər ”.kəs zəkat verməkdən boyun qaçırsa, verməsə dindən çıxmışdır

Zəkatın da xums kimi müəyyən növləri vardır. Bir qismi hər ildə bir dəfə, Fitr bayramında verilir və yalnız maddi cəhətdən verməyə imkanı olanlara vacibdir. Digər qismi isə “əmval”-ın zəkatıdır. Amma heç də bütün var-dövlətə zəkat düşmür, yalnız .doqquz şeyə zəkat düşür

Məsələ:۳۸۹. Zəkat ۹ şeyə vacibdir: ۱-Buğda; ۲-Arpa; ۳-Xurma; ۴-Kişmiş; ۵-Qızıl; ۶-.Gümüş; ۷-Dəvə; ۸-İnək; ۹-Qoyun

Məsələ:۳۹۰. Zəkat o vaxt vacib olur ki, zəkatı veriləcək şeylər nisab həddinə çatsın. Hər :birinin nisab həddi sonrakı səhifədəki cədvəldə verilibdir

Qeyd: Dəvə, inək və qoyunun başqa nisabları da vardır ki, onlarla tanış olmaq üçün "Tovzihul-məsail" risaləsinin ۱۹۲۱-ci məsələsinə baxa bilərsiniz.

## ZƏKATIN HÖKMLƏRİ

.Məsələ:۳۹۱. Əgər heyvan bütün il boyu çölün otundan yesə, onun zəkatı vacibdir

Əgər bütün il boyu yalnız bir müddət yığılmış otdan ya əkilmiş şeydən yesə zəkatı .yoxdur

Məsələ:۳۹۲. Qızıl və gümüşün zəkatı o vaxt vacibdir ki, sikkə halında olsun və onunla müamilə edilsin. Buna əsasən, hazırda qadınların bəzək əşyaları kimi işlətdikləri qızıl və .gümüşə zəkat düşmür

Məsələ:۳۹۳. Zəkat vermək ibadətlərdəndir. Ona görə də onu verəndə, zəkat niyyəti və .qürbət qəsdi edilməlidir

## ZƏKATIN MƏSRƏF OLUNMASI

Məsələ:۳۹۴. Zəkat ۸ yerdə xərclənə bilər (ya hamısına, ya da bə'zisinə). Onların bə'zisini :qeyd edirik

;(Fəqirə və miskin (kasıba ❊

Zəkat verilərsə İslam dininə yönələn, yaxud müharibədə müsəlmanlara kömək edən ❊ ;qeyri-müsəlmanlara

;Öz borcunu verə bilməyən borclulara ❊

Allah yolunda; yə'ni mənfəəti ümumi müsəlmanlara çatan, İslamın xeyrinə olan hər ❊ (bir işə.(۱

## MÜAMİLƏNİN (ALVERİN) HÖKMLƏRİ

.Məsələ:۳۹۵. Müamilə hökmlərini (ehtiyac duyulan qədər) öyrənmək vacibdir

Məsələ:۳۹۶. Haram işlər üçün evi və ya başqa şeyləri icarəyə vermək, satmaq .haramdır

Məsələ:۳۹۷. Əqidədən azdıran kitabların alveri, saxlanması, onları yazmaq, oxumaq, onlardan dərs vermək haramdır. Amma

əgər onlardan düzgün məqsədlə (məsələn, onların icad etdikləri şübhələrə cavab vermək üçün) olsa eybi yoxdur.

Məsələ:۳۹۸. Başqa şey ilə qarışdırılan malı satmaq–əgər qatılan şey mə’lum olmasa (su qatılmış süd kimi), satıcı da alıcıya deməsə haramdır və bu kimi əmələ “müamilədə ğəşş” deyilir.

Məsələ:۳۹۹. Müamilədə alınan və ya satılan malın xüsusiyyətləri mə’lum olmalıdır. Amma onun xüsusiyyətlərini deyib-deməməyin malın alınmağına rəğbət və meyl yaranmasına tə’siri olmasa, deyilməsi lazım deyildir.

Məsələ:۴۰۰. Çəki, yaxud peymanə ilə satılan malın müəyyən miqdarını, həmin cinsdən olan artıq miqdara satsalar (Məsələn, bir ton buğdanı ۱.۵ ton buğdaya satsalar) sələm və haramdır.

Məsələ:۴۰۱. Müstəhəbdir ki, satıcı, müştərilərin arasında öz malının qiymətinə fərq qoymasın. Malının qiymətində (baha satmaq üçün) çox israr etməsin. Onunla müamilə edən şəxs peşman olub müamiləni pozmaq istəsə qəbul etsin (malı geri götürsün).

Məsələ:۴۰۲. Alverdə doğrudan and içmək məkruh, yalandan and içmək haramdır.

## ALVERİN POZULMASI

Məsələ:۴۰۳. Bə’zi hallarda alıcı və ya satıcı alveri poza bilər. O cümlədən:

۱-Alıcı və ya satıcı aldanmış olsalar;

۲-Alverdə müəyyən bir müddətə qədər, onlardan birinin alveri poza bilməsini şərt etsələr. Məsələn, al-verdə şərt etsinlər ki, hər kəs peşman olsa, üç günə qədər malı geri qaytara bilər.

۳-Alver yerindən dağılmamış olsalar; Məsələn, mağazadan malı alıb, oradan çıxmamış geri qaytara bilər.

۴-Alınmış mal eybli olsa və alverdən sonra bunu başa düşsələr;

۵-Satıcı alıcının görmədiyi malın xüsusiyyətlərini deyəndən sonra, deyildiyi kimi

olmadığı mə’lum olsa. Məsələn, satıcı “bu dəftər ۲۰۰ vərəqdir” desə, amma sonra .deyildiyindən az olduğu mə’lum olsa

Məsələ:۴۰۴. Əgər alverdən sonra malın eybli olduğunu başa

.düşsə və dərhal pozmazsa, daha sonra vacib ehtiyata əsasən, pozmaq haqqı yoxdur

## BORC

Borc vermək müstəhəb işlərdəndir ki, Qur’an ayələrində və hədislərdə ona dair çoxlu .sifariş edilmişdir. Borc verənə Qiyamətdə çoxlu savab veriləcəkdir

## BORCUN NÖVLƏRİ

.Müddətli; Bu qismdə borc verən borcu qaytarmasının vaxtını tə’yin edir-۱

.Müddətsiz. Bu qismdə borcun qaytarılma müddətini tə’yin etmir-۲

## BORCUN HÖKMLƏRİ

Məsələ:۴۰۵. Əgər borc müddətli olsa, ehtiyat vacibə görə borc verən vaxtından əvvəl .öz borcunu istəyə bilməz

Məsələ:۴۰۶. Əgər borc müddətsiz olsa, borc verən istədiyi vaxtı öz borcunu geri ala .bilər

Məsələ:۴۰۷. Əgər borc sahibi öz borcunu istəməyə haqlı olanda, borclu şəxs qaytara .bilərsə, gərək dərhal qaytarsın. Əgər tə’xirə salsa, günahkardır

Məsələ:۴۰۸. Əgər borc verən bir müddətdən sonra, (məsələn, bir ildən sonra) aldığından artıq qaytarmasını, yaxud onun üçün bir iş görməsini şərt etsə, riba (sələm) və haramdır. Məsələn, yüz min tümən verib bir ildən sonra yüz iyirmi min tümən .alacağını şərt etsə

Məsələ:۴۰۹. Əgər borc verən verdiyindən çox alacağını şərt etməsə, ancaq borclu şəxs .aldığından çox qaytarsa, bunun eybi yoxdur, üstəlik müstəhbdir

## ƏMANƏTDARLIQ

Əgər insan öz malını bir kəsə verib “sənin yanında əmanət qalsın” desə və o da qəbul .etsə, əmanətdarlığın hökmünə əməl etməlidir

## ƏMANƏTDARLIĞIN HÖKMLƏRİ

Məsələ:۴۱۰. Əmanəti saxlaya bilməyən bir şəxsin ehtiyat-vacibə görə onu qəbul .etməsi caiz deyil

Məsələ:۴۱۱. Bir şeyi əmanət qoyan şəxs hər vaxt istəsə, geri ala bilər. Əmanəti qəbul .edən şəxs də hər vaxt istəsə, onu sahibinə qaytara bilər

Məsələ:۴۱۲. Əmanəti qəbul edən şəxsin onu saxlamaq üçün münasib yeri olmasa, gərək münasib yer hazırlasın. Məsələn, əgər əmanət aldığı şey pul olarsa və evdə .saxlaya bilməzsə, gərək banka qoysun

Məsələ:۴۱۳. Əmanəti qəbul edən şəxs gərək onu elə saxlasın ki, camaat "əmanətə .xəyanət edibdir", yaxud "onu saxlamaqda səhlənkarlıq edibdir" deməsin

:Məsələ:۴۱۴. Əgər əmanət tələf olarsa, onda

Əmanəti qəbul edən şəxs onu saxlamaqda səhlənkarlıq etsə, əvəzini sahibinə ⁕ .qaytarmalıdır

Əgər səhlənkarlıq etməsə və təsadüfən tələf olsa (məsələn, sel aparsa), zamin deyil ⁕ .və əvəzini verməsi lazım (ilzami) deyildir

Məsələ:۴۱۵. Əmanətdar əmanətdən istifadə edə bilməz. Amma sahibinin icazəsi ilə .istifadə edə bilər

## ARİYƏ

Ariyə budur ki, insan öz malını başqasına versin ki, ondan istifadə etsin və əvəzində ondan heç nə almasın. Məsələn, öz velosipedini bir kəsə versin ki, minib evinə getsin .və sonra qaytarsın

Məsələ:۴۱۶. Bir şeyi ariyə verən bir şəxs hər vaxt istəsə onu geri ala bilər. Və ariyə edən şəxs də hər vaxt istəsə onu geri qaytara bilər. Birinci halda geri almaq xalq içində ariyə alanın xəsarətə düşməsinə səbəb olsa, ehtiyat-vacibə görə ona möhlət .verilməlidir

Məsələ:۴۱۷. Əgər ariyə etdiyi mal tələf, yaxud eybli olsa, bu halda onu saxlamaqda səhlənkarlıq və ya ondan istifadə edilməsində həddi keçməyibsə zamin deyildir. Amma əgər onu

saxlamaqda səhlənkarlıq edibsə və yaxud ondan istifadə etməkdə həddi keçibsə, .gərək vurduğu xəsarəti ödəsin

Məsələ:۴۱۸. Əgər əvvəlcədən mala hər hansı zərər, xəsarət dəyərsə ariyəyə götürənin .zamin olacağını şərtləşsələr, gərək vurulan zərəri ödəsin

## TAPILAN ƏŞYALAR

Məsələ:۴۱۹. Əgər bir şəxs bir şey tapsa, amma onu götürməsə, onun öhdəsinə xüsusi .vəzifələr düşmür

Məsələ:۴۲۰. Əgər bir şey tapıb götürsə, onun aşağıda izah olunan xüsusi hökmləri :vardır

Əgər tapılan şeyin qiyməti ۱۲.۶ noxud sikkəli gümüş dəyərindən az olsa və həmin ⁕ şeyin nişanəsi olsa, sahibi isə mə'lum olmazsa, onu özü üçün götürə bilər. Amma hər .vaxt sahibi tapılsa, ehtiyat vacibə görə, onun əvəzini sahibinə versin

Əgər onun qiyməti qeyd olunan dəyərdən az olmasa və sahibini mə'lum edən ⁕ müəyyən əlamətləri olsa, bir həftəyədək hər gün, ondan sonra isə həftədə bir dəfə e'lan etsin. Əgər bir il ərzində e'lan etsə, amma sahibi tapılmasa "sahbini tapsam, ona verəcəyəm" deyə niyyət edərək, malı götürə bilər. Yaxud götürüb sahibi üçün saxlaya bilər ki, nə vaxt tapılsa, ona qaytarsın. Yaxud da sahibinin tərəfindən sədəqə verə bilər. Amma ehtiyat müstəhəb odur ki, mal sahibinin tərəfindən seyyid olmayan fəqirə .sədəqə versin

Məsələ:۴۲۱. Əgər e'lan etməyin faydasız olduğunu bilsə, yaxud sahibini tapmaqdan .ümidsiz olsa, belə ki, e'lan etmək mə'nasız olarsa e'lan etmək lazım deyil

## AYAQQABININ DƏYİŞMƏSİ

Məsələ:۴۲۲. Əgər bir kəsin ayaqqabısını aparsalar və yerinə başqası qalsa, bu halda qalan ayaqqabının onun ayaqqabısını aparan şəxsin olduğunu və o ayaqqabını, qəsdən apardığını və o ayaqqabının əvəzində götürülməsinə razı olduğunu bilsə, habelə sahibini tapa bilməsə və tapılacağından da mə'yus olsa, yaxud onu tapmaq

məşəqqətli olsa, onu öz ayaqqabısının yerinə götürə bilər. səh:١٠۶

Amma əgər onun qiyməti öz ayaqqabısının qiymətindən artıq olsa, sahibini hər vaxt tapsa qiymətinin artıq hissəsini ona verməlidir. Əgər sahibini tapmaqdan naümid olsa, .artıq qiyməti onun tərəfindən seyyid olmayan fəqirə sədəqə verməlidir

Məsələ:۴۲۳. Əgər onun ayaqqabısını aparan şəxs qəsdən aparmasa, yaxud qalan ayaqqabının onun ayaqqabısını aparan şəxsin malı olmadığını ehtimal versə və sahibini də tapa bilməsə və qiyməti də ۱۲,۶ noxud sikkəli gümüş dəyərindən az olsa özü üçün götürə bilər. Amma çox olsa, bir il müddətində e'lan etməli, bir ildən sonra .ehtiyat-vacibə görə sahibinin tərəfindən seyyid olmayan fəqirə sədəqə verməlidir

## QƏSB

Qəsb odur ki, insan nahaq yerə, zülm ilə başqasının malına, yaxud haqqına hakim .(kəsilsin (ələ keçirsin

Qəsb böyük günahlardan biridir ki, bu işi görən şəxs Qiyamət günündə ağır əzaba .düçar olacaq

Məsələ:۴۲۴. Əgər insan bir şeyi qəsb etsə, haram iş görməsindən əlavə, sahibinə .qaytarmalıdır. Əgər tələf olarsa, əvəzini sahibinə verməlidir

Məsələ:۴۲۵. Əgər qəsb etdiyi şeyi xarab etsə, gərək onun (xarab olandan əvvəlki və .sonrakı) qiymətlər fərqini də sahibinə qaytarsın

Məsələ:۴۲۶. Əgər qəsb etdiyi şeydə müəyyən dəyişiklik etsə və nəticədə əvvəlkindən daha yaxşı olsa (məsələn, əgər velosipedi tə'mir etmiş olsa), sahibi "əvvəldə olduğu kimi mənim özümə qaytar" desə ona qaytarmalıdır və çəkdiyi əziyyət müqabilində .muzd ala bilməz və onu əvvvəlki vəziyyətinə salmağa haqqı yoxdur

## YEMƏK VƏ İÇMƏK

Böyük Allah, gözəl təbiəti, bə'zi heyvanları, meyvələri, göyərtiləri istifadə etmək üçün insanın ixtiyarında qoymuşdur ki, onlardan yemək, içmək, geymək, məskən salmaq və özünün başqa ehtiyaclarını tə'min etmək üçün istifadə etsin. Amma insanın 

canının qorunması, bədən və ruhunun sağlamlığı və nəslinin davam etməsi üçün, başqalarının hüququna ehtiram qoymaq üçün müəyyən qanunlar qoymuşdur. Biz .onlardan bə'ziləri–yemək və içmək qaydaları ilə tanış olacağıq

Məsələ:۴۲۷. Ölümə səbəb olan şeyləri və yaxud insan üçün ümumi zərəri olan şeyləri .yemək və içmək haramdır

.Məsələ:۴۲۸. Nəcis şeyləri yemək və içmək haramdır

.Məsələ:۴۲۹. Gil yemək haramdır

Məsələ:۴۳۰. Seyyidüş-şühəda İmam Hüseyn (əleyhissalam)-ın türbətindən şəfa məqsədilə bir az yeməyin eybi yoxdur. (Amma yaxşı olar ki, bir az su ilə qarışdırıb həll .(olandan sonra içilsin

Məsələ:۴۳۱. Hər müsəlmana vacibdir ki, aclıqdan və ya susuzluqdan ölüm ayağında .olan müsəlmana çörək və su verib, onu ölümdən xilas etsin

## XÖRƏK YEMƏYİN QAYDALARI

:Məsələ:۴۳۲. Yemək yeyəndə müstəhəbdir ki

;Yeməkdən qabaq və sonra əlləri yusun ⁕

;Ev sahibi hamıdan qabaq (yeməyə) başlayıb hamıdan sonra çəkilsin ⁕

;Yeməyə başlayanda "bismillah", qurtaranda "əlhəmdu lillah" desin ⁕

;Yeməyi sağ əllə yesin ⁕

Əgər bir neçə nəfər bir süfrənin başında otursa, hər kəs öz qabağında olan ⁕ ;yeməklərdən yesin

;Tikələri kiçik götürsün ⁕

;Xörəyi yaxşı-yaxşı çeynəsin ⁕

;Meyvələri və göyərtiləri yeməkdən qabaq su ilə yusun ⁕

.Məsələ:۴۳۳. Yemək vaxtı bir neçə şey məkruhdur

;Tox halında yemək ❊

;Çox yemək ❊

;Yemək yeyəndə başqalarının üzünə baxmaq ❊

;Xörəyi çox isti, yandıra-yandıra yemək ❊

;Yediyi, yaxud içdiyi şeyi üfürmək ❊

;Çörəyi bıçaqla kəsmək ❈

;Çörəyi yemək qabının altına qoymaq, ona hər növ ehtiramsızlıq etmək ❈

.Meyvəni tam, axıra kimi yemədən atmaq ❈

## SU İÇMƏYİN QAYDALARI

:Məsələ:۴۳۴. Su içməkdə bir neçə şey müstəhəbdir

;Gündüzlər ayaq üstə içmək ❈

;Su içməkdən əvvəl "bismillah", axırda "əlhəmdu lillah" demək ❈

;Suyu üç dəfəyə içmək ❈

Su içəndən sonra İmam Hüseyn (əleyhis-salam) və onun Əhli-beytini yad edib, ❈ .qatillərinə lə'nət göndərmək

:Məsələ:۴۳۵. Su içməkdə bir neçə şey məkruhdur. O cümlədən

;Çox su içmək ❈

;Yağlı yeməklərdən sonra su içmək ❈

;Gecə ayaq üstə su içmək ❈

.Suyu sol əllə içmək ❈

## HEYVANIN BAŞININ KƏSİLMƏSİNİN HÖKMLƏRİ

Məsələ:۴۳۶. Əgər əti halal olan heyvanın boğazındakı dörd böyük damarı hülqumunun aşağı tərəfindən, sonradan deyiləcək göstərişlərə əsasən tam şəkildə kəssələr əti .halal, bədəni pak olur

## HEYVANLARIN BAŞININ KƏSİLMƏSİNDƏKİ LAZIM OLAN ŞƏRTLƏR

:Məsələ:۴۳۷. Heyvanın başının kəsilməsinin ۶ şərti var

;Heyvanın başını kəsən şəxs müsəlman olmalıdır-۱

.Heyvanın başı dəmir şeylərlə kəsilməlidir-۲

Heyvanın başını kəsəndə bədəninin qabaq tərəfi–üzü, ayaqları və qarnı üzü qibləyə-۳ .olmalıdır

.Heyvanın başını kəsəndə Allahın adını zikr etməlidir-۴

.Bismillah” demək kifayətdir“

Heyvan, başı kəsiləndən sonra diri olmasını mə’lum edə biləcək qədər hərəkət-۵ etməlidir, yaxud qan adi qaydada çölə gəlməlidir. (Bu hökm heyvanın başının kəsildiyi (.vaxt diri olmasında şəkli olduğu haldadır. Amma şəkk olmazsa, lazım deyil

Heyvanın öldürülməsi baş kəsilən yerdən (qabaqdan) olsun. Ehtiyat vacibə görə-۶ .boynun arxa tərəfindən kəsilməsi caiz deyildir

## SİLAH İLƏ OV ETMƏ

Məsələ:۴۳۸. Əgər əti halal olan vəhşi hevanı aşağıda deyiləcək şərtlərlə, silahla ovlayıb :öldürsələr, pak və halal olacaq

Ov silahı bıçaq və qılınc kimi kəsici, iti olsun, yaxud nizə və ox kimi iti olsun ki, heyvan ٭ .bədənini parçalasın

.Heyvan ovlayan kəs müsəlman olsun ٭

Silahı ov üçün işlətsin, əgər başqa yeri nişan alsa və təsadüfən heyvana dəysə, (və ٭ .özü ölsə) halal deyil

.Silahı işlədəndə (məsələn, güllə atanda) Allahın adını çəksin ٭

Heyvanı vurandan sonra tələsən halda heyvanın yanına getsin, onun yanına o vaxt ٭ çatsın ki, artıq heyvan ölmüş olsun, yaxud əgər ölməmiş olsa, başını kəsmək üçün vaxt qalmamış olsun. Deməli, əgər ölməmiş olsa və başını kəsmək üçün vaxt qalmış olsa, .onda başını kəsməsə və özü ölsə, haram olur

## BALIQ OVU

Məsələ:۴۳۹. Əgər pullu balığı sudan diri tutsa və sudan kənarda ölsə, pakdır və onu yemək halaldır. Amma əgər suda ölsə, bədəninin pak olmasına baxmayaraq, yeyilməsi .haramdır. Ancaq əgər suyun içində balıqçının torunda ölsə onu yemək halaldır

.Məsələ:۴۴۰. Pulu olmayan balıqları, sudan diri çıxarsalar və kənarda ölsə də haramdır

Məsələ:۴۴۱. Balıq tutanın müsəlman olması və Allahın adını çəkməsi lazım (ilzami) deyildir. Onu sudan diri çıxartdığını və səh:۱۱۴

.kənarda öldüyünü bilsə kifayətdir

## (BAXMAQ VƏ İZDİVAC (EVLƏNMƏ

Allahın insana verdiyi ne’mətlərdən biri də görmək qüdrətidir. İnsan gərək bu böyük ne’mətdən özünün və başqa insanların kamalı, mə’nəvi tərəqqisi yolunda istifadə etsin, onu naməhrəmə baxmaqdan saxlasın. Təbiət və onun gözəlliklərinə, başqalarının hüququna təcavüz etmədən baxmağın eybi yoxdur. Amma gözlərini başqalarına baxmaqdan və özünü də naməhrəmlərin, yadların baxışlarından qoruyub .hifz etməyin xüsusi hökmləri vardır. Biz onlardan bə’ziləri ilə tanış olacağıq

## MƏHRƏM VƏ NAMƏHRƏM

Məsələ:۴۴۲. Məhrəm o kəsdir ki, ona baxmaqda başqalarına nisbətən mövcud .məhdudiyyət yoxdur və onunla evlənmək haramdır

:Məsələ:۴۴۳. Bu adamlar oğlan və kişilərə məhrəmdirlər

;Ana və nənə ❊

;(Qız və övladın qızı (qız nəvəsi ❊

;Bacı ❊

;Bacının qızı ❊

;Qardaşın qızı ❊

;(Bibi (öz bibisi və ata anasının bibisi ❊

.(Xala (öz xalası və ata-anasının xalası ❊

Bu kəslər nəsəbi-qohumluq səbəbi ilə bir-biri ilə məhrəmdirlər. Bə’ziləri də evlənmək :səbəbi ilə kişilərə və oğlanlara məhrəm olurlar. O cümlədən

;Həyat yoldaşı ❊

;Həyat yoldaşının anası (qaynana) və onun nənəsi ❊

* Atanın arvadı (ögey ana);

* Oğulun arvadı (gəlin);

* Qardaşın arvadı və arvadın bacısı (kişiyə) naməhrəmdirlər.

Məsələ:۴۴۴. Aşağıdakı şəxslər qız və qadınlar üçün məhrəmdirlər.

* Ata və baba;

;(Oğul və oğulun oğlu (nəvə ❊

;Qardaş ❊

;Bacıoğlu ❊

;Qardaşoğlu ❊

;(Əmi (öz əmisi və ata-anasının əmisi ❊

.(Dayı (öz dayısı və ata-anasının dayısı ❊

Bu kəslər nəsəbi (nəsillik) qohumluğa görə məhrəmdirlər. Bə’ziləri də evlənmək səbəbi :ilə qızlara və qadınlara məhrəm olurlar, o cümlədən

;Ər ❊

;Qaynata və ərin babası ❊

;(Qızının əri (kürəkəni ❊

.Bacının əri və ərin qardaşı (qadına) məhrəm deyillər ❊

Qeyd olunan şəxslərdən başqa izdivac səbəbi ilə və xüsusi şərtlərlə bir-birinə məhrəm .ola bilər. Bu fiqh kitablarında müfəssəl deyilmişdir

Məsələ:۴۴۵. Əgər qadın fiqh kitablarında göstərilən şərtlərlə bir uşağa süd versə, o uşaq həmin qadına və bə’zi başqa şəxslərə də məhrəm olur ki, əlavə mə’lumat üçün .“Tovzihul-məsail” risaləsinə baxın

## BAŞQALARINA BAXMAQ

Məsələ:۴۴۶. Ər-arvad istisna olmaqla, bir kəsin başqasının bədəninə ləzzət qəsdi ilə baxması haramdır. İstər eyni cinsdən olsunlar (məsələn, kişinin başqa kişiyə baxması kimi), istərsə də müxtəlif cinsdən (kişinin qadına baxması kimi); İstər məhrəm olsunlar, (.istərsə də naməhrəm (bədənin hər yeri də olsa eyni hökmdədir

Məsələ:۴۴۷. Oğlanlar və kişilər onlara məhrəm olan qadınların ovrətindən başqa

.bədənin sair yerlərinə (ləzzət qəsdi olmadan) baxa bilərlər

Məsələ:۴۴۸. Kişilər və oğlanların naməhrəm qadının bədəninə və saçına baxması haramdır. Amma üzünə (dəstəmazda yuyulan qədər) və əllərinə (biləyə qədər) .baxmalarının–ləzzət qəsdi olmazsa – eybi yoxdur

Məsələ:۴۴۹. Qadınlar və qızlar naməhrəm kişinin başına, üzünə və boynunun adətən .örtülməyən yerlərinə baxa bilərlər

## EVLƏNMƏ

Məsələ:۴۵۰. Həyat yoldaşının olmaması üzündən harama düşən (məsələn, naməhrəmə .baxan) şəxsə evlənmək vacibdir

Məsələ:۴۵۱. Nikahda məxsus siyğə oxunmalıdır. Qız və oğlanın sadəcə razılıqları, məhəbbətləri kifayət deyildir. Buna əsasən, nə qədər ki, nikah əqdi oxunmayıb, sadəcə elçilik məhrəmliyə səbəb olmaz və oğlanın evlənmək istədiyi qızın sair .naməhrəm qızlarla heç bir fərqi yoxdur

Məsələ:۴۵۲. Əgər nikah əqdində bir hərfi səhv oxusalar və onun mə’nası dəyişsə, əqd .batildir

## SALAM VERMƏYİN HÖKMLƏRİ

Məsələ:۴۵۳. Başqalarına salam vermək müstəhəb, amma verilən salamın cavabını .almaq vacibdir

.Məsələ:۴۵۴. Namaz halında olan şəxsə salam vermək məkruhdur

Məsələ:۴۵۵. Əgər bir kəs namaz qılana salam versə, gərək necə salam verilibsə, elə də cavab versin. Məsələn, “səlamun əleykum” desə, o da “salamun əleykum” deməlidir. Amma “əleykumus-salam” deyə salam versə, cavabında “səlamun əleykum” .deməlidir

.Məsələ:۴۵۶. İnsanın namaz halında başqasına salam verməsi caiz deyil

.Məsələ:۴۵۷. Salamın cavabı dərhal verilməlidir

Məsələ:۴۵۸. Əgər iki nəfər eyni anda bir-birinə salam versə, hər birinə vacibdir ki, .digərinin cavabını qaytarsın

Məsələ:۴۵۹. Kafirə salam vermək məkruhdur. Əgər o, müsəlmana salam versə, ehtiyat .vacibdir ki, cavabında “əleykə’ və yaxud təkcə “salam” desin

## SALAM VERMƏYİN QAYDASI

Məsələ:۴۶۰. Müstəhəbdir ki, süvari piyadaya, ayaq üstə olan səh:۱۱۷

oturana, sayca az olan dəstə sayca çox olan dəstəyə və kiçiklər böyüklərə salam .versinlər

Məsələ:۴۶۱. Müstəhəbdir ki, namazdan başqa hallarda salamın cavabı, verildiyindən daha yaxşı şəkildə verilsin. Məsələn, əgər bir kəs “səlamun əleykum” deyə salam .versə, cavabında “səlamun əleykum və rəhmətullah” deyilsin

.Məsələ:۴۶۲. Kişinin qadına, xüsusilə də cavan qadına salam verməsi məkruhdur

## QUR’ANIN HÖKMLƏRİ

Məsələ:۴۶۳. Qur’an həmişə pak və təmiz olmalıdır. Onun yazısını, vərəqlərini nəcis .etmək haramdır. Əgər nəcis olarsa, gərək dərhal suya çəkilsin

## (QUR’AN YAZILARINA LƏMS ETMƏK (TOXUNMAQ

Məsələ:۴۶۵. Dəstəmazı olmayan şəxsin Qur’anın yazılarına məss etməsi (yə’ni bədənin .hər hansı bir hissəsini onun yazılarına vurması) haramdır

Məsələ:۴۶۶. Qur’anın yazılarına toxunmaqda onun ayə, kəlmə, hərf və hətta .hərəkələrinə belə əl vurmaq arasında heç bir fərq yoxdur

Məsələ:۴۶۷. Qur’anın kağız, torpaq (yer), divar və ya parça üzərində yazılmasının heç .bir fərqi yoxdur

Məsələ:۴۶۸. Qur’anın yazılarında qələm, çap, təbaşir və ya başqa şeylə yazılması .arasında fərq yoxdur

Məsələ:۴۶۹. Əgər Qur’an yazısı Qur’anda olmasa da ona (dəstəmazsız) toxunmaq haramdır. Deməli, əgər Qur’anın bir ayəsi başqa kitabda yazılsa, hətta onun bir kəlməsi kağız üzərində olsa, yaxud kəlmənin yarısı Qur’an vərəqindən, yaxud başqa .kitabdan qoparılmış olsa, yenə də dəstəmazsız ona toxunmaq haramdır

:Məsələ:۴۷۰. Aşağıdakı hallarda Qur’an yazısına toxunmaq sayılmır və haram deyildir

;Ona şüşə və ya plastikin arxasından toxunmaq ⁕

;(ətrafına (haşiyələrinə) əl vurmaq (bunlar haram deyil, amma məkruhdur

Qur’an tərcümələrinə–hər dildə olursa olsun. Amma Allahın adı bu hökmdən istisna ❋ olunur. Belə ki, Onun adına hər dildə olsa, dəstəmazsız adamın əl vurması haramdır. (.(Məsələn, Xuda, Tanrı və s. kimi

Məsələ:۴۷۱. Əgər yazıçı həm Qur’an, həm də Qur’andan başqa yerlərdə müştərək şəkildə işlənən bə’zi kəlmələri (məsələn, “mö’min” “əlləzi” və s.) Qur’an niyyəti ilə .yazıbsa, dəstəmazsız ona toxunmaq haramdır

.Məsələ:۴۷۲. Qur’anın yazılarına toxunmaq cünub şəxsə haramdır

Məsələ:۴۷۳. Cünub şəxs səcdə surələrini oxuya bilməz. (Bunun təfsilatı ۱۱۱ci məsələdə (.keçdi

## AND İÇMƏK

Məsələ:۴۷۴. Əgər insan müəyyən işi görmək və ya tərk etmək üçün Allahın adlarından birinə, (məsələn, “Tanrı” “Allah” kimi) and içsə (məsələn, iki rəkət namaz qılacağına and .içsə), ona əməl etməsi vacibdir

Məsələ:۴۷۵. Əgər qəsdən öz andına əməl etməzsə gərək kəffarə versin. Kəffarə .aşağıdakı üç şeydən biridir

;Bir qul azad etmək ❋

;On fəqiri doydurmaq ❋

.On fəqiri geyindirmək ❋

.Əgər bunlardan heç birini yerinə yetirə bilməzsə gərək üç gün dalbadal oruc tutsun

Məsələ:۴۷۶. Düz iş üçün and içmək məkruh, yalandan and içmək haramdır və böyük .günahlardan birdir

## MÜXTƏLİF MƏSƏLƏLƏR

Məsələ:۴۷۷. Əgər insan sillə ilə, yaxud hər hansı bir şeylə başqasının üzünə vursa və onun sifəti qızarsa, gərək ۱,۵ şər'i səh:۱۱۹

misqal; əgər göyərsə, ۳ şər'i misqal; və əgər qaralsa, ۶ şər'i misqal sikkəli qızıl versin. (.(Hər şər'i misqal ۱۸ noxuda bərabərdir

Məsələ:۴۷۸. Əgər bir şəxsin üzündən başqa, sair yerləri döymək (vurmaq) vasitəsilə qızarsa, yaxud göyərsə və ya qaralsa əvvəlki məsələdə deyilənlərin yarısı qədər .verməlidir

Məsələ:۴۷۹. Sahibi olmayan və insana əziyyət verən heyvanı (ilan, əqrəb və s. kimi) .öldürməyin eybi yoxdur

Məsələ:۴۸۰. Əgər ustaya düzəltmək üçün bir şey verilsə, sahibi də gəlib onu aparmasa, bu halda usta onu axtarıb tapa bilməsə və tapmaqdan ümidsiz olsa, vacib ehtiyata .görə gərək sahibinin niyyəti ilə seyyid olmayan fəqirə sədəqə versin

Məsələ:۴۸۱. İki nəfərin malı olan divarın (iki mənzilin müştərək divarı kimi) sahiblərinin hər biri digərinin razılığı olmadan onu düzəldə, yaxud üstünə dirək qoya və ya ona mıx çala bilməz. Amma şərikinin razı olduğu mə'lum olan işlərin (divara söykənmək, üstünə paltar asmaq və s. kimi) eybi yoxdur. Amma əgər şəriki "bu işlərə razı deyiləm" desə, .onları etmək caiz deyildir

Məsələ:۴۸۲. Əgər qonşunun ağacının kökü başqasının mülkünə (torpaq, bağ, ev və s.-yə) girsə, mülk sahibi, həmin ağacın sahibindən onu çıxartmasını, yaxud kəsməsini istəyə bilər. Əgər ağacın sahibi bu işi etmək istəməzsə, özü bu işin qarşısını ala bilər. .Ağacın kökündən ona zərər dəyərsə, əvəzini ağacın sahibindən ala bilər

Məsələ:۴۸۳. Bir kəs sahibinin razı olub-olmadığını bilməsə budaqları bağın divarından çölə çıxan ağacların meyvəsini yığa bilməz. Əgər onun meyvələri yerə tökülsə də yerdən yığa bilməz. Amma bağ yol kənarında olsa (fiqhi kitablarda deyilən şərtlər .daxilində), insan ondan istifadə edə bilər

Məsələ:۴۸۴. Əgər banka pul qoyan şəxsə bankdan, qabaqcadan şərtləşməklə deyil, əksinə, camaatı təşviq etmək məqsədi ilə mükafat verilərsə və bu iş bir kəsə zərər .yetirməzsə, halaldır

Məsələ:۴۸۵. Saqqalı dibdən qırxmaq və maşınla dibdən qırxmaq sayılan dərəcədə

Bu hökm bütün camaat üçün eynidir. Camaatın məsxərə etməsi bəhanəsi ilə Allahın hökmü dəyişilmir. Deməli, təzə həddi-büluğa çatan, yaxud saqqalını qırxmazsa camaatın məsxərəsinə mə'ruz qalan bir kəs üzünü qırxsa, yaxud dibdən qırxılmaq .sayılan dərəcədə maşınla vursa, ehtiyat vacibə görə bu iş haramdır

Məsələ:۴۸۶. İstimna etmək (yə'ni insanın mənini çölə gətirmək üçün müəyyən bir iş .görməsi) haramdır

Məsələ:۴۸۷. Çalıb-oynama, toy məclislərinə məxsus olan tərənələr, mahnılar ğina və haramdır. Əgər növhə, yaxud rovzə və ya Qur'an ğina ilə oxunsa, haramdır. Amma .əgər yaxşı səslə, ğina etmədən oxunsa eybi yoxdur

Məsələ:۴۸۸. Şahmat oynamaq qumar məqsədilə deyil, ancaq beynin idmanı, məşğuliyyəti məqsədi ilə olsa, udub-uduzmaqla yanaşı olmasa, haram deyildir. Əgər .bu şərtlərdən biri olmazsa, haramdır

Məsələ:۴۸۹. Məşahid (şəhadət yeri, məqbərə) və hüseyniyyələr istisna olmaqla, başqa yerlərdə kiminsə çıxışında və ya bayram məclisində əl çalmağın–əgər şər'i (qanuni) .işlərə təşviq üçün olsa və başqa haram işlərlə yanaşı olmazsa maneçiliyi yoxdur

**QEYD**

Bu kitabda qeyd olunanlar şər'i hökmlərin hamısı deyil, əksinə gənclərin və yeniyetmələrin ilk növbədə bilməli olduqları, ehtiyac duyduqları məsələlərdir. Ehtiyac .duyulan sair məsələlər üçün "Tovzihul-məsail" risaləsinə müraciət edə bilərlər

**MÜNDƏRİCAT**

səh:١٢٢

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.٢

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.٣

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.١

.Kitab oxumaq müsabiqələrinin təşkili.٢

.Məcazi sərgilərin istehsalı.٣

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.٧

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.٨

.Təlim kurslarının həyata keçirilməsi.٩

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.١٠

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.١١ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.١

ANDROID.٢

EPUB.٣

CHM.۴

PDF.۵

HTML.۶

CHM.٧

GHB.٨

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.١

IOS.٢

WINDOWS PHONE.٣

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹